## BU NÖMRƏDƏ

## Psixologiya



## Qiymətləndirmə



## İnnovasiyalar



## Məktəb tariximizdən



## İlyas Əfəndiyev - 100



## “Azərbaycan məktəbi” - 90



## Rəy və təkliflər

**В этом номере**



**In this number**

# TƏHSİL SİSTEMİNİN YENİDƏN QURULMASINDA VƏ İSLAHATLAR PROSESİNDƏ GƏLƏCƏYİN TƏLƏBLƏRİNİ DƏ NƏZƏRƏ ALMALIYIQ



**MİKAYIL CABBAROV,**
**Azərbaycan Respublikasının təhsil naziri**

Azərbaycanda təhsilin inkişafına yönəlmiş kompleks islahatlar, qabaqcıl ideyalar və layihələr cəmiyyətimizin inkişafına böyük töhfələr verir. Son illər Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin rəhbərliyi ilə ölkəmizdə təhsilin inkişafı istiqamətində çoxsaylı uğurlara imza atılmışdır. Neft kapitalının insan kapitalına çevrilməsi hədəfi dövlət siyasətinin prioritet istiqamətlərindən birini təşkil edir. Bu yöndə həyata keçirilən dövlət siyasəti, Təhsil Nazirliyinin gördüyü işlər, təhsil işçilərinin əzmkarlığı, təşəbbüskarlığı və ən əsası, əldə olunmuş nəticələr qarşıda

duran hədəflərin o qədər də uzaqda olmadığını söyləməyə imkan verir.

Aparılan məqsədyönlü islahatlar ölkəmizi müasir inkişaf səviyyəsinə çatdırmaqla yanaşı, həm də gələcək üçün etibarlı zəmin yaratmışdır. Azərbaycan artıq yeni dövrə - modernləşmə dövrünə qədəm qoymuşdur. Bu dövrün hədəfləri sosial-iqtisadi həyatın qabaqcıl beynəlxalq təcrübəyə uyğunlaşdırılmasından, bu yolla davamlı iqtisadi inkişafın təmin olunmasından, eləcə də əhalinin həyat səviyyəsinin daha da yüksəldilməsindən ibarətdir.

Azərbaycanın qarşıdakı illərdə sosial-iqtisadi və mədəni inkişaf yollarını müəyyənləşdirən "Azərbaycan 2020: gələcəyə baxış" İnkişaf Konsepsiyasında ənənəvi iqtisadiyyatdan "bilik iqtisadiyyatı"na keçidin əsasının qoyulması, bunun üçün həlledici amil olan insan kapitalının adekvat inkişafının ön plana çəkilməsi nəzərdə tutulmuşdur. Bu, təhsil sisteminin də kökündən dəyişdirilməsini, əlavə təhsil, ömür boyu təhsil kimi komponentlərin əhəmiyyətinin artırılmasını zərurətə çevirir. Başlıca strateji məqsədi davamlı iqtisadi artım və sosial rifah olan konsepsiyada təhsilin keyfiyyətinin yüksəldilməsi və müasir təhsil sisteminin qurulması da əsas strateji istiqamətlərdən biri kimi ön plana çəkilmişdir.

BMT-nin İnkişaf Proqramının "İnsan inkişafı indeksi"nə əsasən, Azərbaycan 187 ölkə arasında, 2008-ci ildəki 101-ci yerdən 2013-cü ildə 76-cı yerə yüksəlmiş və insan potensialının yüksək inkişaf etdiyi ölkələr qrupuna daxil olmuşdur. Həmçinin Dünya İqtisadi Forumunun 2013-2014-cü illər üzrə hesabatında Azərbaycan iqtisadiyyatı qlobal rəqabət qabiliyyəti səviyyəsi reytinqində 148 ölkə arasında 39-cu, MDB ölkələri arasında isə 1-ci yeri tutmuşdur.

Sevindirici haldır ki, dünyanın bir çox aparıcı beyin mərkəzləri Azərbaycanın əldə etdiyi uğurları dərindən təhlil və təbliğ edirlər. Bu gün Azərbaycanın siyasi, iqtisadi və sosial modeli nümunə kimi bir sıra nüfuzlu beynəlxalq forum və konfranslarda müzakirə olunmaqdadır.

Biz sabahımızı necə görürük? Bu suala müasir dövrümüzdə insanlar, daha geniş çevrədə dövlətlər və nəhayət, bəşəriyyət cavab axtaran zaman sadə həqiqətə üz tuturlar - təhsilin keyfiyyəti bizə həyat keyfiyyətimizi dəyişməyə, birgə yaşayışın daha sivil formalarını axtarmağa, düşünməyə yardım etməlidir. Yəni təhsil fenomeni dünyanın yeni inkişaf trendlərini müəyyən edir. Bu, dünən də belə olmuşdur, bu gün də belədir, gələcəkdə də belə olacaqdır.

Müasir təhsil sisteminin yenidən qurulması və islahatlar prosesində, biz bu günümüzlə yanaşı, eyni zamanda, gələcəyin tələblərini də nəzərə almalıyıq. Keçmişimiz nə qədər zəngin olsa da, bu günümüz keçmişin deyil. Bu günümüz gələcəyimizindir. Belə ki, indi təhsil alan nəsillər bir neçə illərdən sonra müstəqil həyata qədəm qoyacaq, bir mütəxəssis kimi fəaliyyətə başlayacaqlar. Parlaq gələcək bu gün reallaşan layihələrin qiymətləndirilməsi, davamlılığı və uğurundan asılıdır.

Təhsil sistemi müstəqil Azərbaycanın milli dəyərlərini mənimsəmiş vətəndaş formalaşdırmalı, qloballaşan və müasir dünyada rəqabətədavamlı, peşəkar kompetensiyalara və biliklərə malik bir insan yetişdirməlidir. Ölkəmizin təhsil sisteminin və infrastrukturunun inkişaf səviyyəsinin dünyanın aparıcı təhsil sistemləri səviyyəsinə çatdırılması isə əsas məqsədlərdən biridir.

Qeyd olunan hədəflərə nail olunması üçün bir sıra tədbirlər həyata keçirilmiş, təhsil sistemində şəffaflığın təmin edilməsi, yeni yanaşmaların tətbiqi, müasir idarəetmə modelinə keçilməsi, kadr potensialının səriştə və kompetensiya baxımından gücləndirilməsi və bu kimi digər

məsələlərə xüsusi diqqət yetirilmişdir. Bu baxımdan 2014-cü ilin ötən dövründə də səmərəli nəticələr qazanılmış, nəticəyönlü islahatlar davam etdirilmiş və ölkə təhsilinin səviyyəsinin yüksəldilməsi istiqamətində təsirli addımlar atılmışdır.

Müvafiq məsələlərin köklü həllini nəzərdə tutan "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda müəyyənləşdirilmiş mühüm əhəmiyyətli tədbirlər xüsusilə qeyd olunmalıdır. Belə ki, Dövlət Strategiyasının əsas hədəflərinə və Azərbaycanın inkişaf konsepsiyasına uyğun olaraq, hər bir şəxs üçün bərabər, keyfiyyətli təhsil imkanlarının yaradılması, təhsil sisteminin institusional əsaslarının, infrastrukturunun, eləcə də insan resurslarının inkişaf etdirilməsi sahəsində bir sıra qərarlar verilmişdir. Bütün bunlar texnologiyaları çevik mənimsəməyə, əmək bazarında layiqli yer tutmağa və ömür boyu təhsil prosesinə qoşulmağa imkan verən strateji məqamlardır.

Dövlət Strategiyasının Fəaliyyət Planının hazırlanması məqsədi ilə Təhsil Nazirliyində yaradılmış işçi qrup tərəfindən müvafiq layihə işlənmişdir. Fəaliyyət Planında islahatların məqsədi və strateji istiqamətləri, seçilmiş prioritetlər, onların reallaşdırılması üçün qəbul olunmalı dövlət proqramları, icraya məsul və tərəfdaş qurumlar, aralıq və yekun hədəflər, həmçinin icra dövrü dəqiq şəkildə müəyyən edilmişdir.

Ölkə ictimaiyyətini düşündürən, təhsil sahəsi ilə maraqlanan hər kəsi narahat edən məsələlərin köklü həllini əks etdirən, təhsil islahatlarının daha sistemli aparılması fəlsəfəsini qarşımıza əsas vəzifə kimi qoyan Dövlət Strategiyası bizə təhsildə indiyədək mövcud olan vəziyyəti qiymətləndirməyə və qarşımızda duran yeni hədəfləri müəyyənləşdirməyə imkan verir. Bu sənəd cəmiyyətin bütün spektrini və fəaliyyət sahəsini - təhsilverəndən təhsilalanadək, valideyndən təhsili idarə edənədək, infrastrukturdan maliyyə mexanizminədək əhatə edir.

Sənədə uyğun olaraq Azərbaycan təhsilinin yeni keyfiyyət mərhələsinə keçidi istiqamətində genişmiqyaslı tədbirlərin həyata keçirilməsi nəzərdə tutulur. Dövlət Strategiyasında təhsilin keyfiyyətinin yaxşılaşdırılması, təhsili idarəetmə sisteminin yenidən qurulması, insan resurslarının inkişaf etdirilməsi, müəllim peşəsinin nüfuzunun artırılması, müəllimin karyera inkişafı və fəaliyyətinin stimullaşdırılması, müasir təfəkkürlü Azərbaycan vətəndaşının yetişdirilməsi əsas hədəflərdəndir.

Düşünürəm ki, strategiyanın reallaşdırılması təhsilin məzmununun mənimsənilməsini təmin edən səriştəli təhsilverənlərin formalaşdırılmasına, təhsildə nəticələrə görə cavabdeh, şəffaf, səmərəli tənzimləmə və idarəetmə mexanizmlərinin, müasir tələblərə uyğun və ömür boyu təhsili təmin edən təhsil infrastrukturunun yaradılmasına zəmin yaradacaqdır. Bu sənəd, həmçinin təhsilin infrastrukturunun Azərbaycanın perspektiv inkişaf konsepsiyasına uyğun yenidən qurulmasına imkan verəcək, ölkədə biliklərə əsaslanan iqtisadiyyatın və informasiya cəmiyyətinin təşəkkülünü, davamlı inkişafını təmin edəcəkdir.

Bu sənəddə biz biliklər cəmiyyətinin, kreativ təhsil düşüncəsinin, hədəfləri ölçə bilən bitkin fəaliyyət çərçivəsinin və yeni təhsil fəlsəfəsinin ana xətlərini görə bilirik. Burada əsas ehtiva olunan dəyər odur ki, təhsil Azərbaycanın strateji platformasıdır. Bu baxımdan Dövlət Strategiyasının icrası istiqamətində Təhsil Nazirliyi faydalı əməkdaşlıq əlaqələrinin yaradılmasının əhəmiyyətinə xüsusi önəm verir. Strategiyada nəzərdə tutulan hədəflərə nail olunması prosesində qüvvələr

birləşdirilməli və problemlərin həlli yolları birgə araşdırılmalıdır.

Dövlət Strategiyasının qəbulundan sonra Təhsil Nazirliyi tərəfindən təhsilin bütün pillə və səviyyələrini əhatə edən sistemli tədbirlər həyata keçirilib. Dövlət Strategiyasında nəzərdə tutulan əsas hədəflərin həyata keçirilməsi və ümumi təhsil sistemində aktual problemlərin həlli məqsədi ilə ümumi təhsil məktəblərində həyata keçiriləcək islahatların ən vacib prioritetləri elan olunub. Burada əsas məqsəd məktəblərdə sağlam və səmərəli təhsil mühitinin yaradılması, təhsilin keyfiyyətinin yüksəldilməsi və məktəbin idarə olunmasının müasir tələblər səviyyəsinə qaldırılmasından ibarətdir.

Strategiyada müəllim amilinə xüsusi yanaşma var. Ümumiyyətlə, təhsildə əsas meyar müəllimlə bağlı olmalıdır. Aydındır ki, nə qədər yüksək səviyyəli infrastruktur, tədris vəsaiti, maliyyə imkanları olsa belə, keyfiyyətli müəllim olmadan təhsili inkişaf etdirmək mümkün deyil. Təhsilalanın savadlı və səriştəli şəxs kimi formalaşması, əsasən, müəllimin akademik bacarıqlarından, tədris təcrübəsindən və peşəkarlıq səviyyəsindən asılıdır.

Bilik və bacarıqlarını davamlı artıran müəllimlər təhsilalanların nailiyyətlərinə əlavə töhfələr verir. Yeri gəlmişkən, qeyd edək ki, təhsil islahatı uğurla aparılan ölkələrdə müəllim peşəkarlığının inkişafı üçün stimulların yaradılmasına və müəllim hazırlığının təkmilləşdirilməsinə xüsusi diqqət yetirilir.

Müvafiq stimullaşdırıcı mexanizmlər və səmərəli monitorinq sistemi vasitəsilə müəllim fəaliyyətinin keyfiyyəti artırılmalıdır. Yüksək nüfuzlu təhsilverənin formalaşdırılması istiqaməti üzrə həyata keçiriləcək tədbirlər sırasına müəllimlərin peşəkarlıq səviyyəsinin daim yüksəlməsini təmin edən yeni sistemin yaradılması daxildir. Bu baxımdan təhsilverənlərin əlavə təhsili üzrə strukturların yaradılmasının stimullaşdırılması, pedaqoji heyət üçün yeni modul-kredit və rəqabətəsaslı təlimlər sisteminin yaradılması və digər məqamlar da nəzərdən qaçırılmamalıdır.

Bu istiqamətdə, həmçinin müəllim peşəsinin nüfuzunun artırılması üzrə dövlət siyasətinin inkişafına (səriştə və nəticə əsaslı diferensiallaşdırılmış, əmək bazasında rəqabətqabiliyyətli əməkhaqqı sisteminin yaradılması, müəllimin karyera inkişafı və fəaliyyətinin stimullaşdırılması üzrə yeni sistemin yaradılması və s.) dair bir sıra mühüm işlərin görülməsi də nəzərdə tutulmuşdur.

Ötən dərs ilində ilk dəfə olaraq Bakı şəhərinin ümumi təhsil məktəblərində çalışan müəllimlərin sınaq qiymətləndirilməsi həyata keçirilib. Sınaq qiymətləndirilməsinin nəticələrinə uyğun olaraq növbəti ildən müəllimlərin əməkhaqlarında dəyişiklik olması nəzərdə tutulur. Sınaq qiymətləndirilməsi pedaqoji işçiləri təhsilalanlarla iş üslubunda metodik və kommunikativ yanaşmaları təkmilləşdirməyə sövq edir. Odur ki, növbəti mərhələdə müəllimlərin sınaq qiymətləndirilməsinin bütün ölkə ərazisində tətbiq olunmasını düşünürük.

Həmçinin müəllimlərin dərs yükünün optimallaşdırılması istiqamətində də islahatlar həyata keçirilmişdir. Ümumtəhsil məktəblərində, gimnaziya və liseylərdə, peşə məktəbləri və peşə liseylərində, idman və incəsənət məktəblərində müəllimlərin, məktəbdənkənar təhsil müəssisələrində dərnək rəhbərlərinin həftəlik dərs yükünün maksimal yuxarı həddi 24 saatdan 36 saata qaldırılmışdır.

Müəllimlərin peşəkar inkişafına xidmət edən tədbirlər genişmiqyaslı xarakter daşıyır və eyni zamanda, müəllim hazırlığı sahəsini də əhatə edir. Müəllimlərin hazırlığı ilə bağlı dəyişikliklər nəticə-

sində kolleclərdə müəllim hazırlığı planı köklü şəkildə azaldılıb, bu sahədə əsas üstünlük bir neçə ixtisaslaşmış ali məktəblərə verilib. Burada məqsəd müəllim hazırlığında diqqəti kəmiyyətə deyil, keyfiyyətə yönəltməkdir.

2014-2015-ci tədris ilindən müəllimlik ixtisasına qəbul olunmuş tələbələr üçün xüsusi stimullaşdırma tədbiri həyata keçirilmişdir. Belə ki, müəllimlik ixtisasını öz arzusu ilə seçən və yüksək balla qəbul olunan gənclərə xüsusi imtiyazlar tətbiq edilmişdir. İlk dəfə olaraq ali məktəblərə qəbul imtahanlarında 500-dən çox bal toplayan, birinci sırada müəllimlik ixtisaslarını göstərərək qəbul olunan 300 nəfər tələbə üçün hər ay 100 manat həcmində əlavə "Gələcəyin müəllimi təqaüdü" təsis edilmişdir.

Strategiyada səriştəyə əsaslanan şəxsiyyətyönümlü təhsilin məzmununun inkişaf etdirilməsi birinci istiqamət kimi nəzərdə tutulmuşdur. Beynəlxalq təcrübə göstərir ki, təhsilin məzmunu ilə bağlı başlıca meyillərdən biri kurikulumların ölkənin sosial-iqtisadi inkişaf tələbləri və prioritetləri ilə sıx əlaqələndirilməsindən ibarətdir.

Elmi-texniki tərəqqi, innovasiyalar və modernləşmə nəticəsində praktik bilik və vərdişlərlə zənginləşməyən, sırf nəzəri xarakter daşıyan təhsil öz əhəmiyyətini itirməkdədir. Bu baxımdan təhsilin məzmununun formalaşmasında akademik biliklərlə yanaşı, praktik bilik və bacarıqların, səriştənin vacibliyi önə çəkilir. Çünki səriştəyə əsaslanan təhsil sosial-iqtisadi inkişafa daha səmərəli xidmət göstərir.

Kurikulumların məzmunu texnoloji irəliləyişin gətirdiyi yenilikləri nəzərə almaqla daim inkişaf etdirilir. Bu isə müxtəlif təhsil pillələrində spesifik yanaşma tələb edir. Məsələn: ümumi təhsil pilləsində şəxsiyyətin hərtərəfli formalaşdırılması prioritet olduğu halda, ali təhsildə əmək bazarının cari və gələcək tələbləri əsas götürülür. Kurikulumlara əsaslanan yeni və alternativ dərsliklərin yaradılması, şagird və müəllimlərin müvafiq dərslik seçiminin təmin olunması bu sahədə görüləcək mühüm işlərdəndir. Bunlarla bərabər, istedadlı uşaqlar üçün xüsusi inkişaf proqramlarının, xüsusi qayğıya ehtiyacı olan uşaqlar üçün inkişaf və inklüziv təlim proqramlarının hazırlanması da olduqca vacibdir.

Bütün bunlar bizə o imkanları verməlidir ki, təhsilalan, ilk növbədə, öyrənməyi öyrənsin, yiyələndiyi biliyi bacarıq və vərdişə çevirə bilsin. Məktəb isə müəllim mərkəzli deyil, şagird-öyrənən mərkəzli olsun.

Dərslik yaradıcılığı və nəşri sahəsində gedən prosesləri, dərsliklərin tədrisi zamanı ortaya çıxan problemləri və onların həlli yollarını müəyyənləşdirmək məqsədi ilə həyata keçirilən məqsədyönlü tədbirlər müsbət nəticələr verməkdədir. Artıq dərsliklərin hazırlanması üzrə tender bir il əvvəl elan edilir.

Bu il ilk dəfə olaraq Azərbaycanda maksimum adda və sayda - 271 adda 7,8 milyon ədəd dərslik çap olunub. Bəzi siniflər üçün tam yeni, qalanları üçün təkrar və təkmilləşdirilmiş nəşr olan bu kitablar artıq bütün məktəblərə çatdırılıb.

Növbəti dərs ili üzrə VIII sinif dərsliklərinin hazırlanması ilə əlaqədar tender bu il elan edilib. Tender proseduru üzrə təqdim edilən dərslik maketləri noyabr-dekabr aylarında qiymətləndiriləcək. Qalib elan olunan dərsliklər məhdud sayda çap edilərək 2015-ci ilin yanvar-may aylarında pilot məktəblərdə sınaqdan keçiriləcək. İrad və təkliflər nəzərə alınaraq çap ediləcək, dərs ilinin başlanmasından xeyli əvvəl məktəblərə paylanacaq.

Növbəti tədris ili üzrə, həmçinin IV sinif dərslikləri əsaslı şəkildə təkmilləşdirilərək çap ediləcək, ümumtəhsil məktəbləri-

nin IX sinifləri üçün bir il əvvəlcədən dərsliklərin hazırlanması üzrə tender elan ediləcək. Həmin dərsliklərdən 2016-2017-ci dərs ilində istifadə olunacaq.

Dərslik müəlliflərinin hüquqlarının qorunması və müasir tələblərə cavab verən dərsliklərin hazırlanması üçün onların yaradıcılığa həvəsləndirilməsi, eyni zamanda, dərslik yazılması fəaliyyətinin təşviqini təmin etmək məqsədi ilə Təhsil Nazirliyi tərəfindən dərsliklərin əlavə nəşrindən daxil olan vəsaitin 50 faizinin dərslik müəlliflərinə ödənilməsi qərara alınmışdır. Müvafiq gəlirin digər hissəsinin isə dərsliklərin yazılmasının stimullaşdırılması, bu sahədə mövcud olan beynəlxalq təcrübənin öyrənilməsi və tətbiqi üçün sərf olunması nəzərdə tutulmuşdur.

Təhsil Nazirliyi tərəfindən təhsilalanları təhsil prosesində fəallaşdırmaq, onların İKT-dən səmərəli istifadə etməsinə, dərslikləri elektron formatda oxumasına imkan yaratmaq məqsədi ilə elektron dərslik portalı (www.e-derslik.edu.az) istifadəyə verilmişdir. Hazırda VI sinif üzrə 10 dərslik elektron formatda e-dərslik elektron kitab rəfində yerləşdirilib. Bu ilin sonuna qədər VII sinif üzrə 10, II və III siniflər üzrə 5 dərslik də elektron formatda istifadəçilərə təqdim olunacaqdır.

Bu sistem şagirdlərin dərsliklərdən istifadəsində mobilliyi artıracaqdır. Məktəblilər istənilən vaxt və məkanda dərsliklərə müraciət edə biləcəklər. İstifadəçilər onlayn formada və ya planşetlərdə yükləməklə dərslikləri elektron versiyada oxumaq, onlayn rejimdə dərsliyin istənilən səhifəsində müvafiq lazımi elektron qeydlər aparmaq imkanı qazanacaqlar. Elektron dərsliklər əyani vəsaitlərin - qrafika, animasiya, interaktiv fəaliyyət və digər multimedia xüsusiyyətlərinin, rahat istifadə, axtarış sisteminin mövcudluğu və digər üstünlükləri ilə ənənəvi dərsliklərdən fərqlənir.

Son illər ərzində ölkədə təhsilin inkişafı istiqamətində mühüm addımlar atılmış, təhsilin normativ-hüquqi, maddi-texniki bazası daha da təkmilləşdirilmiş və möhkəmləndirilmişdir. Bu baxımdan həyata keçirilmiş infrastruktur layihələrini xüsusilə qeyd etmək istərdim. Son 11 ildə 3000-ə yaxın məktəb binası tikilmiş və əsaslı təmir olunmuşdur.

Ötən tədris ilində respublika üzrə 240, o cümlədən Bakı şəhərindəki 27 ümumi təhsil müəssisəsində 370 fizika, kimya və biologiya fənn laboratoriyası müasir tələblərə cavab verən avadanlıqlarla təmin olunmuşdur. Bu iş dövlət büdcəsindən ayrılmış müvafiq vəsait hesabına Təhsil Nazirliyinin sifarişi ilə həyata keçirilmişdir.

Təhsil Nazirliyinin təşəbbüsü ilə təhsilalanların sağlamlığı baxımından müstəsna əhəmiyyət daşıyan "Sağlam təhsil-sağlam millət" layihəsi çərçivəsində ölkəmizin 6 ümumi təhsil məktəbinin 15 sinfində pilot olaraq "Sağlam təhsil sinfi" fəaliyyət göstərməyə başlamışdır.

Təhsil müəssisələrində informasiya-kommunikasiya texnologiyalarının tətbiqi əhəmiyyətli dərəcədə genişlənmişdir. Şagird-kompyuter nisbəti və təhsil müəssisələrinin internet bağlantısı üzrə göstəricilər xeyli yüksəlmişdir. Sözsüz ki, təhsil müəssisələrində internetə çıxış imkanları daha da genişləndirilməli, təhsildə informasiya-kommunikasiya texnologiyalarının səmərəli tətbiqi inkişaf etdirilməlidir. Eyni zamanda, müasir, informasiya-kommunikasiya texnologiyalarına əsaslanan təhsil infrastrukturunun, o cümlədən elektron məktəb və elektron təhsil şəbəkəsinin genişləndirilməsi məsələlərinə də diqqət artırılmalıdır.

Yeni tədris ilində Bakı və digər şəhər və rayonlarda yerləşən 20 təhsil müəssisəsinin fiber-optik rabitə kanalları ilə Azərbaycan

Təhsil Şəbəkəsinə və internetə çıxışının təmin edilməsi nəzərdə tutulur. Rayonlarda yerləşən 200 təhsil müəssisəsinin ADSL rabitə kanalları ilə Azərbaycan Təhsil Şəbəkəsinə və internetə çıxışı təmin olunacaq.

Bu ildən elektron təhsil texnologiyalarının tətbiqinin genişləndirilməsinə başlanılacaq. Belə ki, "Labdisc" laboratoriya avadanlıqlarının milli tədris sistemində tətbiq edilməsi, Azərbaycan dilində açıq təlim resurslarının, təhsil müəssisələrində istifadə üçün müxtəlif fənlər üzrə elektron dərsliklərin yaradılması və "Bulud" sistemi üzərindən yayılması, habelə müxtəlif fənlər üçün elektron resursların hazırlanması da vacib məsələlərdəndir.

"Elektron məktəb" layihəsi çərçivəsində, ümumilikdə 43 məktəb elektron jurnallardan istifadə edir. Cari ildə bunlardan 11-i kağız jurnal əvəzinə tam olaraq elektron jurnaldan istifadəyə keçəcək. Bununla da yalnız elektron jurnallardan istifadə edən məktəblərin sayı 31 olacaq.

Bir sıra sahələrdə, o cümlədən ilk peşə-ixtisas təhsili müəssisələrində son 25 ildə ilk dəfə texniki avadanlıqla, ləvazimatlarla təchizat məsələləri həll olunmuşdur. Belə ki, ilk peşə-ixtisas təhsili müəssisələrinə 11 təlim avtomobili, 30 adda 37 ədəd müasir kənd təsərrüfatı texnikası, əyani və texniki təlim vasitələri verilmişdir.

Peşə təhsilinin inkişafının əsas prioritet olduğu nəzərə alınaraq, bu il ilk-peşə ixtisas təhsili müəssisələrinə qəbul planı əmək bazarının tələbləri araşdırılaraq tərtib edilmişdir.

İlk peşə-ixtisas təhsili sahəsində əsas yeniliklərdən biri də yerli və beynəlxalq təşkilatların dəstəyi ilə ilk dəfə olaraq peşə təhsili müəssisələrinə rəhbər kadrların hazırlanması üzrə xüsusi kursların təşkilidir. Həmin kursların təşkilində əsas məqsəd peşə təhsili müəssisələri üçün idarəetmə sahəsində müasir tendensiyalar haqqında bilik və bacarıqlara sahib olan gələcək menecerlərin hazırlanmasıdır. İlkin mərhələdə təlimlərin Bakı şəhərində fəaliyyət göstərən ilk peşə-ixtisas təhsili müəssisələrini əhatə etməsi nəzərdə tutulmuşdur.

İlk peşə-ixtisas təhsili müəssisələrinin infrastrukturunun inkişafı sahəsində müvafiq işlər və dövlət-biznes partnyorluğuna əsaslanan layihələr uğurla icra olunur. Təhsil Nazirliyinin həyata keçirdiyi "Müasir Azərbaycan peşəkarları" layihəsi partnyorlarla faydalı işbirliyi şəklində davam etdirilir. Layihə peşə təhsili sisteminin əhatə dairəsinin genişləndirilməsinə və kadr hazırlığı prosesinin keyfiyyətinin yüksəldilməsinə xidmət edir. Ümumilikdə, bu sahənin inkişafı Təhsil Nazirliyinin əsas prioritetləri sırasındadır.

"Ümumi təhsil müəssisələrinə və peşə liseylərinə müəllimlərin yerdəyişməsi və işə qəbulu Qaydaları"na müvafiq olaraq hazırda işləyən müəllimlərin bir rayondan (şəhərdən) digər rayona (şəhərə) yerdəyişməsi ilk dəfə olaraq Təhsil Nazirliyi tərəfindən mərkəzləşdirilmiş qaydada müsabiqə yolu ilə həyata keçirilmişdir. İş yerini dəyişmək üçün 1149 nəfər müəllim elektron ərizə vermiş, yekun nəticəyə əsasən 96 nəfər iş yerini dəyişmək hüququ qazanmışdır.

2014-2015-ci tədris ilində ümumi təhsil müəssisələrinə və peşə liseylərinə müəllimlərin işə qəbulu üzrə müsabiqənin nəticələrinə əsasən, ümumilikdə 1692 nəfər işə qəbul olunmuşdur ki, onlardan 1405 nəfərinə (83%) həvəsləndirmə tədbirləri tətbiq edilmişdir. Vakansiyaların tutulma səviyyəsi ötən dərs ilinə nisbətən 40 faiz artmışdır.

Təhsil Nazirliyinin təklifləri nəzərə alınaraq Nazirlər Kabinetinin qərarı ilə "Pedaqoji profilli ixtisaslar üzrə ali və orta ixtisas təhsili müəssisələrini bitirmiş və ümumi təhsil müəssisələrində işə başlamış gənc mütəxəssislər üçün əlavə güzəştlər və stimullaşdırıcı tədbirlərin

müəyyən edilməsi haqqında" Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2010-cu il 14 aprel tarixli, 67 nömrəli qərarında dəyişikliklər edilmişdir.

Qərara əsasən, dövlət sifarişi üzrə ümumi təhsil müəssisələrində əmək fəaliyyətinə başlayan və 3 il müddətində həmin təhsil müəssisəsində fəaliyyətini davam etdirən gənc mütəxəssislərə kommunal xidmətləri və yaşayış yerinin kirayə haqqını ödəmək üçün 60 manat məbləğində kompensasiya veriləcək, rayon mərkəzlərindən 20 kilometrdən artıq məsafədə yerləşən ümumi təhsil müəssisələrində əmək fəaliyyətinə başlayan gənc mütəxəssislərə 3 il müddətində aylıq əməkhaqqına ayda 100 manat məbləğində əlavə ödəniləcəkdir. Qeyd etmək lazımdır ki, dəyişikliklərdən əvvəl həmin vəsaitlərin həcmi müvafiq olaraq 40 və 70 manat təşkil edirdi. Beləliklə, rayon mərkəzindən 20 kilometrdən artıq məsafədə yerləşən ümumi təhsil müəssisələrində əmək fəaliyyətinə başlayan gənc mütəxəssislərə veriləcək kompensasiya və əlavənin ümumi miqdarı 160 manat olacaq.

Məlumat üçün bildirək ki, hazırda yeni işə başlayan müəllimin bir stavka (12 saat) dərs yükü üçün aylıq əməkhaqqı 155 manat təşkil edir. Kompensasiya və stimullaşdırıcı tədbirlər də əlavə edilərsə, əmək haqqı 315 manat olacaq. Stavka artdıqca əməkhaqqı da müvafiq olaraq artacaq.

Kənd rayonlarında əmək fəaliyyətinə başlamaq üçün konkret iş yerlərinə göndəriş almış gənc mütəxəssislərə, həmçinin yol xərci, əmlakın daşınması üçün nəqliyyat xərci və ilkin yaşayış şəraitinin yaradılması məqsədi ilə əməkhaqqının iki misli həcmində birdəfəlik yardım da ödəniləcəkdir.

Qərarda əhəmiyyətli yeniliklərdən biri də ondan ibarətdir ki, 3 illik müddət bitdikdən sonra həmin və ya digər kənd məktəbində pedaqoji fəaliyyətini davam etdirən gənc mütəxəssislərə daha 2 il müddətinə kompensasiya və əməkhaqqına əlavə ödəniləcək. Müddətin uzadılması gənc mütəxəssislərin işlədikləri kənddə məskunlaşmasının təmin olunmasına xidmət edir. Aparılan təhlillər göstərir ki, gənc mütəxəssislərin bir hissəsi 3 illik müddət ərzində məskunlaşma imkanları yarada bilmədiklərinə görə müddət bitdikdən sonra iş yerlərini tərk edirlər.

Təhsil nazirinin əmri ilə "Müəllimlərin etik davranış qaydaları" təsdiq edilmişdir. Qaydalara əsasən, ilk dəfə olaraq bu tədris ilində yeni işə qəbul olunanlar "Müəllim andı" içərək fəaliyyətə başlamışlar.

"Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda təhsil müəssisələrində nəticəyönlü və şəffaf idarəetmə modelinin yaradılması, strateji idarəetmənin tətbiqi, təhsil müəssisələrinə idarəetmə, akademik, maliyyə və təşkilati muxtariyyət verilməsi kimi hədəflər müəyyənləşdirilmişdir. Həmin hədəflərə nail olunması istiqamətində ilk dəfə olaraq məktəb direktorları və gələcəkdə bu vəzifədə çalışmaq arzusunda olan pedaqoji kadrların peşəkarlıq səviyyəsinin artırılması üzrə yeni mexanizmin tətbiqinə başlanılmışdır. 547 nəfər pedaqoji kadr müsabiqədə iştirak etmək üçün müraciət etmiş, 3 mərhələli müsabiqə mexanizmi əsasında 50 nəfər seçilib və təlimlərə cəlb olunmuşdur.

Təlimlərin məqsədi peşəkar kompetensiyalara və idarəetmə bacarıqlarına malik məktəb rəhbərlərinin hazırlanması və rəhbər vəzifələrə təyin edilməsidir. Təlimlərdə uğur qazanmış şəxslərdən 15 nəfəri Bakı şəhərinin ümumi təhsil məktəblərində vakant direktor vəzifəsinə təyin edilmişdir. Yeni mexanizm daha da təkmilləşdirilərək geniş səviyyədə tətbiq olunacaq.

Təhsil Nazirliyi bir sıra digər müvafiq qurumlarla əməkdaşlıq çərçivəsində Bakı şəhərinin ümumi təhsil məktəblərində çalı-

şan direktorlar və gələcəkdə bu vəzifədə çalışmaq arzusunda olan direktor müavinləri üçün növbəti təlimlərə start verib.

"Azərbaycan 2020: gələcəyə baxış" İnkişaf Konsepsiyasına uyğun olaraq regional kolleclərin yaradılması işinə başlanılmışdır. Nazirlər Kabinetinin müvafiq qərarları ilə Masallı Dövlət Regional Kolleci və İsmayıllı Dövlət Humanitar və Texnologiya Kolleci yaradılmışdır.

Ali təhsilin beynəlxalq təcrübəyə uyğun təkmilləşdirilməsi, yeni maliyyələşdirmə mexanizminin tətbiqi sahəsində islahatlar davam etdirilmiş, bu təhsil müəssisələrinin təhsil-tədqiqat-innovasiya mərkəzlərinə çevrilməsinə dəstək verən və rəqabətqabiliyyətli mütəxəssis hazırlığını təmin edən məzmunun yaradılması istiqamətində işlərə başlanılmışdır.

Yeni tədris ilindən ali təhsil müəssisələrində ilk dəfə olaraq SABAH qrupları fəaliyyətə başlamışdır. Ölkənin ali məktəblərindən müvafiq ixtisaslar üzrə seçilmiş 738 ən yaxşı tələbə təhsilini yeni qruplarda davam etdirir.

2014-2015-ci tədris ilindən etibarən ali təhsilin bakalavriat səviyyəsində məzunun bilik, bacarıq və vərdişlərinə qoyulan kompetensiyaları özündə əks etdirən 138 ixtisas üzrə yeni nəsil təhsil proqramlarının və buna müvafiq hazırlanmış tədris planlarının tətbiqinə başlanmışdır. Müəllim hazırlığı aparılan ali təhsil müəssisələrində qoşa ixtisaslar (riyaziyyat və informatika, kimya və biologiya, tarix və coğrafiya) üzrə kadr hazırlığı 5 illik tədris planları əsasında aparılacaq.

Bu tədris ilinin II semestrindən tələbələr üçün güzəştli təhsil krediti və qrantları layihəsinə başlanılması planlaşdırılır. Hazırda Təhsil Nazirliyində bununla bağlı iş başa çatmaq üzrədir.

Bu günədək xaricdə təhsil üzrə Dövlət Proqramı çərçivəsində 3184 nəfər xaricdə təhsil almaq üçün göndərilmişdir. Bu il seçim prosesində daha çox üstünlük bakalavrdan sonrakı təhsil səviyyələrinə verilmiş və proqramın təkmilləşdirilməsi istiqamətində müəyyən islahatlar həyata keçirilmişdir. Dövlət qurumlarının və ali təhsil müəssisələrinin nümayəndələrinin iştirakı ilə keçirilən müsahibələr nəticəsində dünyanın aparıcı ali təhsil müəssisələrində təhsil almaq hüququ qazanmış 572 tələbənin adı proqram təqaüdçüləri siyahısına daxil edilmişdir. Bu tələbələr Harvard Universiteti, Oksford Universiteti, HEC Paris, Moskva Dövlət Beynəlxalq Münasibətlər İnstitutu kimi ali təhsil müəssisələrindən məzun olmaqla, qısa bir müddətdə Azərbaycana dönərək müvafiq sahələrin davamlı inkişafına öz töhfələrini verəcəklər.

Ölkəmizdə təhsilin inkişafı bizdən, bizim fəaliyyətimizdən, üzərimizə düşən vəzifələri necə yerinə yetirəcəyimizdən birbaşa asılıdır. Əminəm ki, Azərbaycan təhsili özünün zəngin mütərəqqi ənənələrinə, milli-mənəvi və ümumbəşəri dəyərlərə, beynəlxalq təcrübəyə əsaslanaraq daha da inkişaf edəcək, dünya təhsil sistemində öz layiqli yerini tutacaqdır.

**"Azərbaycan" qəzeti,**
**24 oktyabr 2014-cü il**

**Təhsil siyasəti**

# AZƏRBAYCANÇILIQ ANLAYIŞININ TƏHSİLALANLARA MƏNİMSƏDİLMƏSİ

**Nizami Cəfərov,**
***Azərbaycan MEA-nın müxbir üzvü, filologiya üzrə elmlər doktoru, professor, millət vəkili***

Azərbaycan müstəqillik yolunda ilk addımlarını atan bir respublika kimi dünyanın inkişaf etmiş ölkələri sırasına daxil olmaqdadır. O, bu gün sosial, iqtisadi, mədəni sahələrdə irəliləyərək böyük uğurlar qazanmışdır. Cəmiyyətin sosial inkişafının əsasında dayanan təhsil sahəsində aparılan islahatlarla uğurlu nəticələrə nail olmuşdur. Ən başlıcası Azərbaycan vətəndaşının mənəvi-siyasi zəmində gələcək həyatını, varlığını, eləcə də bir şəxsiyyət kimi missiyasını müəyyən edən prioritet istiqamətlər müəyyənləşdirilmişdir. "Təhsil haqqında" Azərbaycan Respublikasının Qanununda göstərilmişdir ki, təhsilin əsas məqsədi "Azərbaycan dövlətinin qarşısında öz məsuliyyətini dərk edən, xalqının milli ənənələrinə və demokratiya prinsiplərinə, insan hüquqları və azadlıqlarına hörmət edən, vətənpərvərlik və azərbaycançılıq ideyalarına sadiq olan, müstəqil və yaradıcı düşünən vətəndaş və şəxsiyyət yetişdirmək"dən ibarətdir. Bu məqsədin həyata keçirilməsində, reallaşdırılmasında hər bir təhsil müəssisəsi özünün imkanları daxilində bu vəzifələri yerinə yetirməkdə məsuliyyət daşıyır. Eyni zamanda milli və demokratik ənənələrə söykəməklə bir vətəndaş və şəxsiyyət kimi həyata keçirdiyi müstəqil və yaradıcı fəaliyyətini azərbaycançılıq məfkurəsinə əsasən qurmalıdır. Bu məfkurə milli təfəkkürə rəvac verən, onu daha da inkişaf etdirən bir düşüncə tərzi, təfəkkür mədəniyyətidir. Özünün milliliyini qoruyub saxlamaqla qlobal dünyaya qovuşmaqla bu təfəkkür tərzi ən etibarlı yanaşmadır. Ona görə də hazırkı zamanda təhsilin mühüm paradiqmalarından birinə çevrilmiş azərbaycançılığın bir dəyər kimi təhsilalanlara mənimsədilməsi təxirə salınmaz bir vəzifə kimi öz həllini gözləyir.

İlkin araşdırmalar onu göstərir ki, azərbaycançılığın təhsilalanlara aşılanmasından əvvəl, bu anlayışın mahiyyət və məzmununun aydınlaşdırılmasına ehtiyac vardır. Çünki çox hallarda bu anlayışla bağlı müxtəlif şərhlərin fikirlərin olması müşahidə edilir. Elə bu səbəbdən də azərbaycançılıq anlayışının fəlsəfi sosialoji yöndən mahiyyətini açıqlamağı lazım sayırıq.

Azərbaycanın etnik tarixi nə qədər qədim olsa da, "azərbaycanlı" anlayışı e.ə. I minilliyin ortalarından etibarən formalaşmağa başlamışdır. Öz mənşəyini Atropatena dövlətinin adından alan Azərbaycan toponimi sonrakı əsrlərdə etimoloji məzmununu dəyişərək daha çox "Odlar yurdu" mənasında dərk olunmuş, təxminən 500 min km2 bir coğrafiyanı ifadə etmişdir. Azərbaycanda ən qədim dövrlərdən Qafqaz, İran və türk etnosları yaşamışlar, lakin Azərbaycan xalqı I minilliyin ortalarından II minilliyin ortalarına qədərki dövrdə məhz türk etnosları əsasında (Qafqaz və İran etnoslarını özündə ehtiva etməklə) formalaşmış, azərbaycanlıların əsas dili türk mənşəli Azərbaycan dili olmuşdur. Ona görə də Azərbaycan xalqı, yaxud azərbaycanlılar dedikdə, birinci növbədə, öz tarixi vətənlərində min illər boyu yaşayan, türklük əsasında birləşmiş superet-

nos nəzərdə tutulur. Azərbaycan superetnosunun tarixində XVI əsr xüsusilə seçilir: məhz bu dövrdə xalqımız ilk dəfə vahid dövlət ətrafında təmərküzləşmək imkanı qazanır. Azərbaycan Səfəvilər dövləti tədricən öz etnik mahiyyətini dəyişsə də, xalqın sosial-siyasi təfəkkürünün bütövləşməsinə həlledici təsir göstərir. Və XVI əsrdən başlayaraq Azərbaycan millətinin təşəkkülünün əsası qoyulur. Sonrakı əsrlərdə müxtəlif dövlətlərin – imperiyaların siyasi təsiri altına düşən, öz ərazi bütövlüyünü itirən Azərbaycan xalqının milli-mənəvi iradəsini sarsıtmaq mümkün olmur, bununla belə siyasi özünütəsdiq imkanlarının məhdudlaşması milli mütəşəkkilliyə müəyyən zərbə vurur. XIX əsrin sonu, XX əsrin əvvəllərində milli məfkurəyə çevrilən azərbaycançılıq dünyagörüşü təşəkkül tapır ki, bu dünyagörüş – ideologiya xalqın ictimai-siyasi özünüifadəsinin generatoruna çevrilir.

Azərbaycan xalqının təfəkküründə "Vətən" anlayışının tarixi Azərbaycan xalqının tarixi qədər qədim və zəngindir. İlk eposumuz olan (və xalqın təşəkkülünün ilkin mərhələlərində formalaşan) "Dədə Qorqud" qədim azərbaycanlının epik dünyagörüşündə vətənpərvərlik hislərinin nə qədər güclü olduğunu parlaq şəkildə nümayiş etdirir ki, həmin hislər Azərbaycan xalqını heç bir tarixi mərhələdə tərk etməmiş, XIX əsrin sonu, XX əsrin əvvəllərindən etibarən yeni keyfiyyət qazanmış, siyasi-ideoloji məzmun kəsb etmişdir.

Yalnız azərbaycanlıların deyil, bütün Şərq xalqlarının ilk respublikası olan Azərbaycan Xalq Cümhuriyyəti dövründə azərbaycanlı anlayışı ilk dəfə olaraq siyasi məzmun daşımağa, vətəndaşlıq mənsubiyyəti bildirməyə başlayır. Milli ziyalıların, xüsusilə Azərbaycan Cümhuriyyətinin siyasi elitasının milli mütəşəkkillik uğrunda apardıqları mübarizə azərbaycançılıq dünyagörüşünün formalaşmasına təsir göstərir. Türklük, müsəlmanlıq və müasirlikdən ibarət olan azərbaycançılıq ideologiyası Cümhuriyyətin məfkurəsinə çevrilir. AXC Azərbaycanın tarixi ərazisini bütövlükdə əhatə etməsə də, öz vətənində yaşayan azərbaycanlıların hamısının dövləti olmasa da, elə bir mühüm siyasi faktor oldu ki, Azərbaycan xalqının iradəsini ifadə etmək, onun perspektiv bütövlüyünə işıq salmaq imkanını yaratdı. AXC-nin süqutundan sonra da, sovet dövrünün bütün məhrumiyyətlərinə baxmayaraq azərbaycançılıq ideologiyası müəyyən qədər deformasiyaya uğrasa da yaşamaqda davam etdi. Cəfər Cabbarlı, Üzeyir Hacıbəyli, Səməd Vurğun, Heydər Hüseynov, Mirzə İbrahimov kimi görkəmli Azərbaycan ziyalıları öz populyar əsərləri ilə bu ideologiyanı nəinki susmağa qoymadılar, hətta kommunist-sosialist qanunlarının verdiyi imkan daxilində, hətta bir sıra hallarda irəli gedərək inkişaf etdirdilər. Sovetlər Birliyinin bölücü siyasətinin tüğyan etdiyi dövrdə Azərbaycanın elm, mədəniyyət xadimləri xalqın milli bütövlüyü uğrunda mübarizəni davam etdirərək Azərbaycanın Şimalı ilə Cənubu arasında əlaqələrin kəsilməməsinə çalışdılar. Sovetlərin çökməsindən sonra meydana çıxan, özünü Azərbaycan Xalq Cümhuriyyətinin varisi elan edən müstəqil Azərbaycan dövləti azərbaycanlı anlayışına yeni siyasi məzmun gətirdi.

Azərbaycan Respublikasının 1995-ci ildə qəbul olunmuş Konstitusiyası Azərbaycan xalqı, azərbaycanlılar, Azərbaycan vətəndaşlığı kimi mühüm anlayışların hüquqi təfsirini verməklə bir sıra məsələlərə aydınlıq gətirdi. İstər müstəqil Azərbaycan Respublikası ərazisində, istər öz tarixi vətənində (Azərbaycan Respublikası, İran, İrak, Dağıstan, Gürcüstan və Şərqi Anadoluda), istərsə də Vətəndən kənarda yaşayan azərbaycanlıların milli mənəvi birliyinin yaranmasında Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyev, onun yürütdüyü mükəmməl milli siyasət xüsusi rol oynadı. Respublika daxilindəki milli qarşıdurmanı aradan qaldı-

ran, dünya azərbaycanlılarının Azərbaycan Respublikası ətrafında sıx birləşməsi uğrunda mübarizə aparan, onların milli mənəvi bütövlüyünün təmin olunmasına çalışan ümummilli liderin bu sahədəki xidmətləri hər bir azərbaycanlı tərəfindən etiraf olunmaqdadır. Onu da qeyd etmək lazımdır ki, Heydər Əliyev şəxsiyyəti dünya azərbaycanlılarının birlik, mütəşəkkillik simvoluna çevrilmişdir.

Sayı 50 milyonu keçən azərbaycanlıları dil, din, mənəviyyat kimi etnoqrafik-mədəni özünəməxsusluqlar birləşdirir. Təxmini hesablamalara görə azərbaycanlıların beşdə dördü öz tarixi vətənində, beşdə biri isə Vətəndən kənarda yaşayır.

"Azərbaycanlı" anlayışının strukturuna:

1) Azərbaycan türkləri;

2) Azərbaycanda yaşayan, türk mənşəli azərbaycanlılarla qaynayıb qarışmış Qafqaz, İran mənşəli milli azlıqlar;

3) özünü azərbaycanlı hesab edən hər bir kəs daxildir.

Tarix elə gətirmişdir ki, 50 milyondan artıq azərbaycanlının beşdə birindən də azı müstəqil Azərbaycan Respublikasının vətəndaşıdır. Lakin nəzərə almaq lazımdır ki, bu, müasir dünya üçün o qədər də qeyri-təbii sayılmır; qlobal dəyərlərin mühüm əhəmiyyət kəsb etdiyi, dünyanın «böyük bir kənd» halına gəldiyi bir dövrdə azərbaycanlıların müxtəlif dövlətlərin vətəndaşları olması onların milli birliyi üçün mümkün qədər az maneə yaratmalıdır. Hər şeydən əvvəl ona görə ki:

1) azərbaycanlıların siyasi iradəsini ifadə edən, milli mənəvi dəyərləri rəhbər tutan müstəqil dövlət (Azərbaycan Respublikası);

2) xalqın formalaşdığı, etnik yaddaşa dərindən həkk olunmuş tarixi vətən-etnoqrafik coğrafiya;

3) özünəməxsus adət-ənənələr, dil, din, etnososial dünyagörüşü, etnik-mədəni vərdişlər sistemi;

4) "azərbaycançılıq" ideologiyası;

5) və nəhayət, Heydər Əliyevin şəxsində ümummilli lider mövcuddur.

Dünya azərbaycanlılarının milli birliyini təmin edən, onların dünya birliyinə təbii inteqrasiyasını şərtləndirən vasitə olaraq Türk dünyasının rolu get-gedə güclənməkdədir. Dinin müasir dövrdə insan mənəviyyatına təsir imkanlarının genişləndiyini nəzərə alsaq, azərbaycanlıların birliyinin digər bir konteksti kimi İslam Dünyası ilə əlaqələr də mühüm əhəmiyyət kəsb etməkdədir.

Və beləliklə, hər bir azərbaycanlı özünəməxsus aləmi ilə yanaşı: a) türk dünyasının, b) islam dünyasının və c) ümumən dünyanın övladıdır.

Bu məqalə azərbaycançılıq anlayışını təfərrüatı ilə əhatə edə bilməsə də, onun haqqında müəyyən təsəvvür yaradır. Təhsil prosesində azərbaycançılıq dəyərinin formalaşdırılmasında əsas rol oynaya biləcək zəruri məzmunun yaradılması baxımından əhəmiyyət daşıyır.

Azərbaycançılığın bir dəyər kimi təhsilalanlarda formalaşdırılması üçün ilk növbədə təhsilin məzmununu təşkil edən ayrı-ayrı fənlərdə potensial imkanlar yaradılmalıdır. Belə ki, həm məzmuna aid tələblər müəyyənləşdirilməli, həm də müvafiq təlim materiallarının seçilməsinə nail olunmalıdır. Bundan əlavə, zəruri təlim texnologiyalarının, strategiyalarının hazırlanmasında azərbaycançılığın formalaşdırılması aparıcı məqsədlərdən birinə çevrilməlidir.

Biz kiçik bir araşdırmanın nəticəsi olaraq, bu qeydləri apardıq. Lakin qənaətimiz ondan ibarətdir ki, azərbaycançılıq anlayışının təhsilalanlara mənimsədilməsi xüsusi araşdırma tələb edən bir məsələ kimi özünün həllini gözləyir.



# ÜMUMİ TƏHSİL STANDARTLARI: BƏZİ PSİXOPEDAQOJİ XÜSUSİYYƏTLƏR

**Ənvər Abbasov,**
***Təhsil Problemləri İnstitutunun direktor müavini, pedaqogika üzrə fəlsəfə doktoru, dosent***

***Açar sözlər:*** *məzmun anlayışı, ümumi təhsil standartları, psixopedaqoji xüsusiyyətlər, strateji fəaliyyət, inkişafetdirici konsepsiya, kreativ şəxsiyyət.*

***Ключевые слова:*** *понятие содержания, общие стандарты образования, психолого-педагогические особенности, стратегическая деятельность, концепция развития, творческая личность.*

***Key words:*** *notion of content, general education standards, psycho-pedagogical features, strategic activity, developmental concept, creative personality.*

Ümumi təhsilin mühüm komponentlərindən biri olan məzmun anlayışını açıqlamaq, pedaqoji problem kimi həll etmək üçün ona müasir kontekstdə yanaşmaq, bu gün üçün zəruri olan məsələləri şərh etmək vacib hesab edilir. Belə məsələlərdən biri ümumi təhsil standartları və onların psixopedaqoji xüsusiyyətləridir.

Araşdırmalardan gəldiyimiz qənaət bundan ibarətdir ki, nəinki ümumi təhsil, ümumiyyətlə, Azərbaycan təhsili üçün standart, onun pedaqoji müstəvidə şərhi, demək olar ki, yenidir. Xüsusilə ötən əsrin 90-cı illərindən pedaqoji aləmdə səslənməkdə olan bu söz ingilis mənşəli olub norma, nümunə, ölçü mənasında işlədilir. Azərbaycan dilinin izahlı lüğətində qeyd olunduğu kimi, "standart ingilis sözüdür. Öz ölçüsünə, formasına, keyfiyyətinə görə tələbata cavab verən hər hansı bir şeyin nümunəsi. Bir şeyin təşkilində, qurulmasında, hazırlanmasında, həyata keçirilməsində tətbiq edilən forma, eyni tip, eyni nümunə"dir.

Ümumiyyətlə, mənbələrdə standart haqqında daha ümumi məlumat verilməklə, onun quruculuq işində, xüsusən də istehsalatda, texnikada zəruri olması göstərilir. Dünyada belə standartların üç növə bölündüyü: dövlət standartları, sahə standartları və respublika standartlarının olduğu qeyd edilir. Eyni zamanda təhsil standartları barədə danışılır. Artıq ötən əsrin 70-ci illərindən başlayaraq təhsilin məzmununun standartlaşdırılması, başqa sözlə, təhsil standartlarının yaradılmasına təşəbbüs göstərilir. Dünyanın ABŞ, İngiltərə, Avstraliya, Kanada, eləcə də Avropanın inkişaf etmiş ölkələrində təhsil standartlarının hazırlanmasına başlanılır.

Əslində dünya təhsilində baş verən bu dəyişiklik köklü, həm də ciddi konseptual xarakter daşıyır. Bu, onun daha mümkün olan uğurlarının konkret izlənməsi və dəyərləndirilməsi tələbindən irəli gəlir. Bunun üçün isə təhsilin nəticələrdən ibarət məzmununun yaradılmasının vacibliyi müddəası irəli sürülür ki, hazırda dünyanın inkişaf etmiş ölkələrində aparılan təhsil islahatlarında bu vacib tələbin yerinə yetirilməsinə xüsusi diqqət yetirilir.

Azərbaycanda təhsil standartı anlayışına ötən əsrin 90-cı illərindən başlaya-

raq müraciət olunsa da, həmin dövrlərdə fundamental pedaqoji araşdırmalarda, xüsusilə pedaqogika dərsliklərində ona, demək olar ki, münasibət bildirilmədi, sonralar təhsil standartları barədə pedaqoji mülahizələr yarandı, onların mahiyyəti açıqlandı. Pedaqoqlardan Ə.X.Paşayev və F.A.Rüstəmov bu məsələ barəsində qeyd edirdilər ki, "Təhsil standartı dedikdə, ictimai idealı əks etdirən, bu ideala nail olmaq üçün şəxsiyyətin və təhsil sisteminin real imkanlarını nəzərə alan və dövlət təhsil normaları kimi qəbul edilən əsas parametrlər sistemi kimi başa düşülür".

Göründüyü kimi, bu yanaşmada standartlar dövlətin təhsil normaları, əsas parametrlər sistemi kimi izah edilir. Əslində, doğrudan da, təhsil standartlarının yaradılmasında dövlətin bu sahədə siyasətinin olması və ona ardıcıl olaraq xüsusi normalar çərçivəsində yanaşılması və istiqamət verməsi təhsilin idarə olunması baxımından məqsədəuyğun hal kimi dəyərləndirilir. Görünür, elə bu səbəbdəndir ki, ölkənin 1992-ci ildə təsdiq edilmiş Təhsil Qanununun 7-ci maddəsində həmin məsələ barəsində xüsusi qeyd verilir: "Azərbaycan Respublikasında dünya standartlarına müvafiq olan dövlət standartları tətbiq edilir" (2).

2005-ci ildə artıq Müstəqil Azərbaycanın müxtəlif sahələrdə, o cümlədən təhsildə özünə məxsus olan siyasəti müəyyənləşir ki, burada dövlətin ümumi təhsil standartlarını müəyyənləşdirdiyi xüsusi olaraq vurğulanır: "Dövlət ümumi təhsil standartlarını müəyyən edir".

İnkişaf etmiş ölkələrdən biri kimi Azərbaycanın dünyanın proqressiv ölkələrinin cərgəsində olması onun strateji fəaliyyətinin baş xəttini təşkil edir. Dünyanın standartları səviyyəsinə çatmaq, bunun üçün təhsilin bütün imkanlarından istifadə etmək başlıca tələb kimi meydana çıxır. Ə.Ə.Əlizadə və H.Ə.Əlizadə özünün psixopedaqoji araşdırmalarında müasir təhsil konsepsiyasının özünəməxsus cəhətlərindən danışaraq qeyd edir ki, "Müasir təhsil konsepsiyası şəxsiyyətin formalaşmalaşdırılmasını təhsil sisteminin başlıca vəzifəsi hesab edir" (7). Doğrudan da, bu gün cəmiyyətin qabağa getməsi, inkişaf etməsi şəxsiyyətin formalaşmasından daha çox asılıdır. Psixoloqların gəldiyi qənaət də məhz bundan ibarətdir ki, "yeni təfəkkürün konseptual modeli məhz insan amilinə əsaslanır. Müasir təhsil konsepsiyası şəxsiyyətin formalaşmasını təhsil sisteminin başlıca vəzifəsi kimi dəyərləndirir". Şəxsiyyət amili cəmiyyətin sosial- iqtisadi, mənəvi problemlərinin həll olunmasında vacib məqam hesab edilir ki, burada təhsilin üzərinə çox ciddi vəzifələr düşür.

Bu mövqe bilavasitə təhsil müəssisələrinin, xüsusən məktəblərin fonunda meydana çıxır. Məktəb özünün humanist yanaşmalarında şagirdin əvəzsiz mövqeyini yüksək qiymətləndirməklə onu cəmiyyətin missiyalarını daşıyan etibarlı bir insana çevirmək uğrunda fəaliyyətini tənzimləyir.

Ümumi təhsil şəxsiyyətin inkişafı müstəvisində ona müasir cəmiyyətin tələbləri baxımından yanaşmaqla işini qurmağa çalışır. Bu texnologiya, ilk növbədə, cəmiyyətin ehtiyac və tələbatlarının nəzərə alınması kimi müsbət qarşılanmaqla yanaşı, həm də şagird şəxsiyyətinin maraqlı olan tərəflərdən biri kimi rəğbətini qazanır.

Yeri gəlmişkən qeyd etmək lazımdır ki, qlobal dünyanın təhsil məkanında icbari olaraq nə isə qəbul etdirmək uğurlu texnologiya kimi qəbul olunmur. Bu yanaşma tərzi qeyri-demokratik xarakteri ilə müasir düşüncəmizdən uzaq olan bir fəaliyyət kimi inkar edilir.

Uşaqlarda rəğbət hissinin yaranması onların maraq hissinin əsasında dayanmaqla onu stimullaşdırır. Öyrənmənin daha səmərəli qurulması üçün təbii vasitəyə çevrilir.

Müasir məktəbin inkişafetdirici konsepsiyasının nüvəsində şəxsiyyətin modeli dayanır ki, hər addımda onu irəlilətmək, bir pillə qabağa aparmaq sadəcə sosial-pedaqoji mahiyyət daşımır. O həm də özünəməxsus psixopedaqoji anlamda başa düşülür.

Bu günün insanı elə bir mühitdə yaşayır ki, onu daim sadəcə elmi biliklər deyil, həyat, yaşayış üçün vacib olan informasiyalar izləyir. O, bu informasiyalar axınında özünü daha çox idraki bacarıqları, kommunikativ qabiliyyətləri ilə tənzimləyir. Bundan əlavə, yaradıcı keyfiyyətləri ilə seçilməyə başlayır. Bu gün belə insanlar kreativ keyfiyyətlərə malik olan insanlar kimi dəyərləndirilir.

Görəsən, kreativ insan, şəxs kimdir? Kreativlik müasir dünyamızda şəxsiyyətin ən vacib keyfiyyəti hesab olunur. Bu keyfiyyətdə yüksək düşüncənin nəticəsi olan yaradıcılıq özünü parlaqlığı ilə göstərir. "Kreativ şəxsiyyətin təxəyyülü özünün parlaqlığı, qeyri-adiliyi, gözlənilməz çalarları, obrazlılığı ilə seçilir" (7). Göründüyü kimi, kreativlikdə heç kimdə olmayan bir qeyri-adiliyin, eləcə də emosional çalarları ilə daha çox diqqəti cəlb edən bir obrazlılığın olması əlamətdar keyfiyyətlər hesab edilir. Bunlar həm də həyatda qazanılması mümkün olan keyfiyyətlər hesab edilir. Məktəb özünün inkişafetdirici, humanist missiyasında həmin bu dəyərlərin formalaşdırılması vəzifəsini daşıyır.

Məlum olduğu kimi, zamanın informasiyalar bolluğunda sadəcə seyrçilik missiyasını daşıması yol verilməzdir. Burada informasiyalara yaradıcı yanaşmaq, zəruri-ni zəruri olmayandan seçə bilmək, eləcə də proqnostik və diaqnostik fəaliyyətləri istiqamətləndirənləri fərqləndirmək vacib keyfiyyətlər hesab olunur. Bütün bu əməliyyatların mərkəzində isə idrak prosesləri dayanır. Psixopedaqogikada qəbul olunmuş belə bir müddəa vardır ki, "Şagirdlər yeni informasiyanı idrak prosesləri vasitəsilə mənimsəyirlər" (8). Bu zaman onlar özünəməxsus təfəkkür fəaliyyəti göstərməklə informasiyaların ən zəruri olanlarını mənimsəyir və fəaliyyətlərinin əsasına gətirirlər. Fəal həyat mövqeyinin formalaşmasına dəstək olan, onu qoruyub saxlayan və kreativ bacarıqları ilə dəyərləndirilən belə insanların inkişafının tənzimlənməsi mürəkkəb olduğu qədər vacibdir. Bu zərurətin yerinə yetirilməsi işində dəqiq müşahidələrin aparılması, inkişafın mərhələlər üzrə düzgün getməsinin diqqət mərkəzində saxlanılması əsas texnoloji tələblərdəndir. Bütün bunların obyektiv olaraq baş verməsində isə konkret səviyyələri ifadə edən standartların olması çox vacibdir. Artıq son onilliklərdə təhsil standartları təhsil sisteminin zəruri parametri kimi tədqiqat obyektinə çevrilmişdir. Bu da ondan irəli gəlmişdir ki, "təhsil standartları sosial-pedaqoji fenomen kimi meydana çıxmışdır" (9). Təhsildə, xüsusən də ümumi təhsildə şagird səviyyəsinin müəyyən olunması üçün indiyədək ondan etibarlı vasitə yaranmamışdır.

Məşhur rus təhsilşünası E.D. Dneprovun qeyd etdiyi kimi, "yeni pedaqoji sistem", "yeni tip pedaqoji insan" haqqında qlobal suallar meydana çıxarır (10). Bu sualların əsasında onun bir şəxsiyyət kimi formalaşmasını təmin edən idraki, hissi emosional və psixomotor bacarıqlar dayanır ki, bunun da özünəməxsus psixopedaqoji cəhətləri vardır.

Əlbəttə, bütün bu fikirlərin əsasında belə qənaətə gəlmək olar ki, zaman keçdikcə həyat dəyişir. Yeni ehtiyac və tələbatlar meydana gəlir. Onlar öz növbəsində reallaşdıqca əhəmiyyətini itirmiş ənənəvi yanaşmalar sıradan çıxır. Ən yaxşı halda konservləşərək tarixin qucağına sığınır. Başqa sözlə, tarixi-pedaqoji əhəmiyyət daşımaqla sadəcə yaddaşlarda qalır. Tədqiqatçı İ.A. Kolesnikova bu prosesi təhlil edərək belə nəticəyə gəlir ki, "artıq yeni təhsil sivilizasiyasının yaran-



* 2

ması müşahidə olunur. Kreativ-pedaqoji sivilizasiyanın meydana gəlməsi mövcud olan təbii və reproduktiv sivilizasiyaların mövcudluğuna son qoyur" (11). Beləliklə, düşüncə ilə müşayiət olunan insanların yaradıcılıq qabiliyyəti fonunda nəzərə çarpan bir epoxanın başlanması aydın görünür.

Dünyanın inkişaf etmiş ölkələrindən biri kimi Azərbaycan da özünün proqressiv fəaliyyətindən tarixi faktları qeyd etməklə müxtəlif dövrlərin salnaməsini yaradır. Burada əhəmiyyətlilik, diqqət və qayğı ön planda dayanır. Hər şeydən öncə, müəllimlik faəliyyətində bütün istiqamətlərdə fəaliyyətlərə aid konkret standartların yaradılması istiqamətində iş aparılır.

Təhsilin məzmununun ölçülə bilən nəticələr formasında ifadə edilməsi, başqa sözlə, nəticəyönümlü bir məzmunun yaradılması pedaqoji fikir tariximizin ən önəmli səhifələrindən hesab olunur. Doğrudur, o fikirlər müasir araşdırmaların fonunda tarixilik baxımından fundamental əhəmiyyət daşıyır. Lakin inkişafyönümlülüyün nəzərə alınması istər təhsildə, istərsə də pedaqogikada yeni standartların qəbul edilməsini tələb edir ki, bu fikirdə iki prioritet müddəanın vacibliyi aydın görünür. Onlardan birincisi, təhsilin standartlaşmasıdır ki, inkişaf prosesinin izlənilməsində bu prosesin önəmli rolu vardır. Standartların yaradılması inkişafın tənzimlənməsi üçün əvəzsiz praktik əhəmiyyət daşıyır. İkinci isə pedaqogika elmində standartlar haqqında elmi fikrin formalaşması ilə əlaqədardır ki, bu da daha çox məsələnin nəzəri-fundamental tərəfi ilə əlaqədardır. Xüsusilə didaktikada innovasiyaların nəzərə alınması mühüm pedaqoji anlayışların, o cümlədən təhsilin məzmununda mahiyyət etibarilə yeni yanaşmaların yer alması bu baxımdan fikrimizi əsaslandırmaq üçün nümunə ola bilər.

Təhsil standartlarının yaradılması Azərbaycanda müstəqillik illərinin mühüm prioritet təhsil hadisələrindən biri kimi qeyd olunur. Başqa sözlə, Azərbaycan dövlətinin təhsil siyasətinin mühüm istiqamətlərindən biri kimi dəyərləndirilir. Ona görə də 1999-cu ildə ölkədə həyata keçirilən təhsil islahatının ilk ilində "Azərbaycan Respublikasında ümumi orta təhsilin dövlət standartları" qəbul olunur. İlk dəfə olaraq bu sənəddə ümumi orta təhsilin mahiyyəti, strukturu və demokratik prinsiplərə uyğun olaraq qurulmuş bazis tədris planı verilir. İki komponentdən ibarət olan bazis tədris planında təhsil sahələri və siniflər üzrə həftəlik dərs saatlarının miqdarı öz əksini tapır.

Ümumi orta təhsilin strukturunda təhsil sahələrinə aid ən ümumi nəticələr və fənlər təqdim olunur.

Bu dövlət sənədi özündən əvvəlki sənədlərdən nə qədər mütərəqqi olsa da, onda ölçülə bilən konkret nəticələrin olmaması ona nəticəyönümlü sənəd kimi yanaşılmasını çətinləşdirir. Bu sənəd Azərbaycanda ilk ümumi təhsilin standartı kimi bütövlükdə ümumi təhsilin məzmun və strukturunu əhatə etməklə yanaşı, həm də pedaqoji fikrimizə yeni yanaşma tərzi gətirir, dövlət standartının fərqli mahiyyətini açıqlayır.

Bir daha onu söyləmək lazımdır ki, bu sənəd ümumi təhsilin tarixində ilkin nəticəyönümlü məzmunun yaradılmasına təşəbbüs göstərilməsi kimi qiymətləndirilir. Ən başlıcası demokratik prinsiplərlə qurulan ümumi təhsilin məzmununa aid xarakterik nümunələrdən biri qabarıq şəkildə diqqəti cəlb edir. Eyni zamanda yeni pedaqoji üslubda ümumi təhsilin məzmununun qurulmasının bünövrəsini təşkil edir.

2006-cı ildə hazırlanaraq hökumət tərəfindən təsdiq olunan "Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu)" ölkəmizdə standartların hazırlanmasının növbəti mərhələsi hesab oluna bilər. Bu sənəd həm də özünün məzmununa və quruluşuna görə, demək olar ki, yeni pedaqoji yanaşmaların əsasını təşkil edir.

Standartların hazırlanmasında mühüm addım kimi qiymətləndirilən bu sənədin, təbii ki, əvvəlkilərdən fərqi vardır. Çünki müqayisəli təhlillər apardıqca ümumi təhsilin məzmununun müəyyənləşdirilməsinə verilən yeni tələblərin və yanaşmaların üstünlüyü, strateji xarakter daşıması daha qabarıq şəkildə büruzə verir. Keçmiş sovetlər dönəmində qəbul olunmuş və bu gün də mövcud vəziyyətlərə görə istifadə edilən ənənəvi modelə nəzər salsaq, məzmun yalnız hər bir fənn üzrə bölmə, bəhs və mövzuları əks etdirən tədris proqramlarının hazırlanması ilə məhdudlaşır ki, həmin proqramlar əsas etibarilə fənyönümlü xarakter daşıyır, həm də bəzi hallarda proqram müəllifləri bir az da “irəli gedərək” fənlə elm sahəsini eyniləşdirdikləri üçün fənnin məzmununa sistemli şəkildə müvafiq elm sahəsinə aid biliklər daxil edilir.

Təhsilin yeni məzmunu sahəsində həyata keçirilən siyasətə görə isə başlıca diqqət “şagirdlərdə idraki bacarıqların, ilk növbədə, təhlil, tətbiq və dəyərləndirmə bacarıqlarının, nitq və ünsiyyət mədəniyyətinin, müstəqil qərar qəbul etmə və tədqiqatçılıq qabiliyyətinin formalaşdırılmasına yönəldilir, verilən biliklərin zəruriliyi, həyatla bağlılığı, bilavasitə inkişafa, dünyagörüşün genişlənməsinə xidmət etməsi ön planda saxlanılır”.

Yeni konsepsiyada ilk dəfə ümumi təhsilin səviyyələri üzrə nəticələr verilir. Həmin nəticələrdə şagirdlərin hər hansı səviyyə üzrə mənimsədikləri bacarıqlar ifadə olunur. Eyni zamanda hər təhsil səviyyəsi üzrə fənlərə aid nəticələr də ümumiləşdirilərək sənədə daxil edilir.

“Fənlər üzrə ümumi təlim nəticələri, əslində məzmunu müəyyən edən əsas standartlar fənn kurikulumlarında dövlət tələbi kimi bütün siniflər üçün dəyişməz qalır və alt standartlar vasitəsilə sinifdən sinfə inkişaf edir”.

Nəzərə alınsa ki, ümumi təhsilin səviyyələri üzrə də ümumi nəticələr verilir və onlar şagirdlərin hər təhsil səviyyəsindəki inkişafını ifadə edir, o zaman bu nəticələrin də təhsil standartı olduğunu söyləmək mümkündür.

Yeri gəlmişkən qeyd etmək lazımdır ki, 2006-cı ildə qəbul olunmuş bu sənədin ən dəyərli xüsusiyyətlərindən biri orada səviyyələr üzrə ümumi və fənlərə aid nəticələrin ifadə edilməsidir. Mahiyyət etibarilə bu nəticələr şagirdlərin müəyyən səviyyədə əldə edəcəkləri nailiyyətləri əhatə edir. Başqa sözlə, onlar xarakter etibarilə milli səviyyədə müəyyənləşdirilmiş standartlardır.

Bu nəticələr ölkədə milli səviyyəli qiymətləndirmə mexanizmlərinin, onların təşkili işinin pedaqoji xarakterini müəyyənləşdirmək baxımından əhəmiyyət daşıyır. Bütövlükdə milli qiymətləndirmə texnologiyalarının didaktik əsasını təşkil edir.

2007-ci ildə Milli Kurikuluma əsasən ibtidai siniflərin fənn kurikulumları təsdiq olunur ki, həmin kurikulumların tərkibində standartlar da təsdiq edilir.

2009-cu ildə “Təhsil haqqında” Azərbaycan Respublikasının Qanunu qəbul edilir. Bu qanun müasir Azərbaycan cəmiyyətinin inkişafını təmin edə bilən, dəstəkləyən elə bir dövlət sənədidir ki, orada qlobal dünyanın təhsil parametrləri baxımından, demək olar ki, ən müasir mexanizmlərin nəzərə alınmasına diqqət yetirilmişdir. Xüsusilə dövrün ən müasir təhsil problemləri kimi standart anlayışına, hazırkı məktəb sisteminə, onun əhəmiyyəti, mahiyyəti və məzmunu məsələlərinə diqqət yetirilmiş, onlara xeyli aydınlıq gətirilmişdir. Təhsil Qanununda göstərilir ki, “Təhsil sahəsində dövlət standartları fərdin, cəmiyyətin, dövlətin tələbatına uyğun olaraq, elmi-pedaqoji prinsiplər əsasında hazırlanan və müəyyən dövr (5 ildən az olmayaraq) üçün vahid dövlət tələblərini əks etdirən ümumi normalar məcmusudur” (3). Deməli,

təhsil sahəsində dövlət standartları ümumi normalar məcmusudur. Eyni zamanda müəyyən prinsiplər əsasında hazırlanmış sənəddir ki, müasir Azərbaycan məktəbində bu sənədlərin öyrənilib tətbiq olunması dövlət tələbi kimi həyata keçirilir. Onun pozulması yolverilməz hal kimi qəbul edilir. Bundan əlavə, qanunda açıq şəkildə göstərilir ki, "Dövlət təhsil standartları təhsil sahəsində sınanmış mütərəqqi beynəlxalq meyarla, milli və ümumbəşəri dəyərlər nəzərə alınmaqla müəyyən edilir" (3).

Sonuncu təhsil qanununda təhsil standartlarının məzmunu göstərilir: "Dövlət Təhsil standartı təhsilin məzmununu, idarə olunmasını, maddi-texniki və tədris bazasını, infrastrukturunu, təhsilverənlərin keyfiyyət göstəricilərini, hər bir təhsil pilləsində təhsilalanların bilik, bacarıq və vərdişlərinin səviyyəsini müəyyənləşdirir" (3).

Bunlardan əlavə, təhsil qanununda təhsil müəssisələrinin standart tələbə uyğun fəaliyyət göstərməsi barədə də qeyd edilir. Onlardan istifadənin məktəbin məsuliyyətinə verilməsi məqsədəuyğun hesab olunur.

Yeni təhsil qanunu Azərbaycanda təhsil quruculuğunun ən müasir prinsiplərini müəyyənləşdirdi. Xüsusən təhsil islahatında daha konkret parametrləri göstərməklə onların yenidən hazırlanmasını tələb etdi. Odur ki, təhsilin bütün normativ-hüquqi bazası yeniləşdirildi. Belə ki, 2006-cı ildə qəbul olunmuş Milli Kurikulum Təhsil Qanununun tələbləri baxımından yenidən nəzərdən keçirildi və "Ümumi təhsil pilləsinin dövlət standartı və proqramları (kurikulumları)" adı ilə yeniləşdirilərək 2010-cu ildə hökumət tərəfindən təsdiq olundu. Bu sənəd, adından da göründüyü kimi, məzmununda iki məsələni ehtiva edirdi. Onlarda birincisi, ümumi təhsil pilləsinin dövlət standartı, ikincisi isə ümumi təhsil pilləsinin proqramı idi. Göründüyü kimi, burada kurikulum anlayışına əvvəlki illərdən fərqli yanaşmanın olduğu aydın şəkildə diqqəti cəlb edir. Başqa sözlə, standart və kurikulum anlayışları ayrı-ayrılıqda təqdim olunur. Sənədin "Ümumi müddəalar" bölməsinin 2-ci maddəsində qeyd edilir:

"Dövlət standartları aşağıdakıları həll edir:

-ümumi təhsilin məzmununu;

-ümumi təhsilin idarə olunmasını;

-ümumi təhsilin maddi-texniki və tədris bazasını;

-ümumi təhsilin infrastrukturunu;

-ümumi təhsil sistemində təhsilverənlərin keyfiyyət göstəricilərini;

-ümumi təhsil sistemində təhsilalanların bilik, bacarıq və vərdişlərinin səviyyəsini" (4).

Ümumi təhsilin dövlət standartları onun bütün sahələrdə durumunun və fəaliyyətinin formalaşmasına yönəlmişdir. Təhsilin məzmunu ilə yanaşı, idarə olunması, maddi-texniki və tədris bazası, infrastrukturu, təhsilverənlərin keyfiyyət səviyyəsi, elecə də təhsilalanların bilik, bacarıq və vərdişlərinin səviyyəsinə aid dövlət tələbləri burada əhatə edilmişdir. Bu, əslində dövlət standartı məfhumunun daha geniş anlamda başa düşülməsini göstərir. Eyni zamanda yuxarıda sadalanan sahələrin vahid bir şəbəkədə birləşməsi ilə onların əlaqəli olmasını aydın şəkildə ifadə edir.

Sənədin təhsil proqramı (kurikulumu) bölməsində isə təhsil proqramına (kurikulumuna) aid parametrlər aşağıdakı kimi ifadə olunur:

-ümumi təhsilin səviyyələri üzrə təlim nəticələri və məzmun standartları;

-ümumi təhsilin hər bir səviyyəsində tədris olunan fənlər;

-ümumi təhsilin səviyyələri üzrə həftəlik dərs və dərsdənkənar məşğələ saatlarının miqdarı;

-ümumi təhsil sistemində pedaqoji prosesin təşkili prinsipləri;

-təlim nailiyyətlərinin (nəticələrinin) qiymətləndirilməsi və monitorinqi (4).

Bu sənədin proqram (kurikulum) hissəsində ümumi təhsilin səviyyələri üzrə təlim nəticələri, məzmun standartları, eləcə də fənlər və həmin fənlərə aid təlim nəticələri (məzmun standartları) təqdim olunur. Maraqlı olan odur ki, hökumətin təsdiq etdiyi bu sənəddə məzmun standartları vacib element kimi öz yerini tutmuşdur.

Bu sənədə əsasən onu tamamlayan mühüm normativ-hüquqi sənədlər kimi ümumi təhsil məktəblərinin V-XI sinifləri üçün təhsil proqramları (kurikulumları) hazırlanaraq təsdiq olunmuşdur ki, standartlardan ibarət məzmun kurikulumun birinci hissəsi kimi daxil edilmişdir.

Ümumi təhsilin nəticəyönümlü məzmununun yeniləşdirilməsi sahəsində işlər davam etdirilir. Bu gün gündəmdə dayanan vacib məsələ onikiillik təhsilin tələbləri baxımından əldə olunmuş nailiyyətləri nəzərdən keçirmək və ümumi təhsilin psixopedaqoji əsaslara söykənən yeni standart və kurikulumlarını hazırlamaqdan ibarətdir.

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasının Konstitusiyası. Bakı: Qanun, 2005.

2. Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu. Bakı, 1992.

3. "Təhsil haqqında" Azərbaycan Respublikasının Qanunu. Bakı, 2009.

4. Ümumi təhsil pilləsinin dövlət standartı və proqramları (kurikulumları). Təhsil qanunvericiliyinə dair normativ-hüquqi sənədlər toplusu. II cild. Bakı:Şərq-Qərb, 2012.

5. Əlizadə Ə. Yeni pedaqoji təfəkkür: psixopedaqogikaya giriş. Bakı, 2008.

6.Əlizadə Ə. Yeni pedaqoji təfəkkür. Bakı: Adiloğlu, 2000.

7. Əlizadə Ə., Əlizadə H. Əsrin meqameyilləri: psixopedaqoji problemlər. II cild. Bakı, 2008.

8. Əlizadə Ə. İdrak prosesləri və hisslər. Psixopedaqoji məsələlər. Bakı, 2006.

9. Байденко В. Образовательный стандарты. Опыт системного исследования. Новгород, 1999.

10. Днепров Е. Школьная реформа между вчера и завтра. М., 1999.

11. Колесникова И. Педагогическая цивилизации и их парадигм. М.:Педагогика, 1995.

**А.Аббасов**

**Стандарты общеобразования: некоторые психолого-педагогические особенности**

**Резюме**

В статье рассматриваются стандарты общего образования как одна из педагогических проблем. Это объясняется как широко используемый термин в последнее время. Разьясняется ее актуальность на сегодняшний день, раскрываются специфические психолого-педагогические особенности со ссылками на выводы ученых, проводящих научно-педагогические исследования о стандартах образования.

**A.Abbasov**

**General education standards: some psycho-pedagogical features**

**Summary**

In article the general education is approached as one of the pedagogical problems. It's explained as a widely used term at last times. There is reported its actuality for today, its specific psycho-pedagogical features refer to the conclusions of the scientists conducting scientific-pedagogical researches about education standarts.



# İNTELLEKTUAL BACARIQLARIN İNKİŞAF SƏVİYYƏSİNƏ TƏSİR GÖSTƏRƏN MÜHİTİN TƏNZİMLƏNMƏSİ

**Firədun İbrahimov,**
***AMİ-nin Şəki filialının professoru, pedaqogika üzrə elmlər doktoru***

***Açar sözlər**: intellektual bacarıqlar, metaidrak, yaradıcı təfəkkür, tənqidi təfəkkür, tapşırıq, interaktiv təlim, psixoloji dəstək, fasilitator, motivasiya, refleksiya.*

***Ключевые слова:** интеллектуальные навыки, метасознание, творческое мышление, критическое мышление, задание, интерактивное обучение, психолгическая поддержка, фасилитатор, мотивация, рефлекция.*

***Key words:** intellectual skills, meta-cognition, creative thinking, critical thinking, assignment, interactive training, psychological assistance, facilitator, motivation, reflection.*

Yaradıcı surətdə, elmi şəkildə düşünməyə qabil şəxsiyyətlər yetişdirmək vəzifəsinin həyata keçirilməsində bilik, intellektual bacarıq və vərdişlərə yiyələnmə mühüm rol oynayır (4). Əqli tərbiyə dedikdə, bilik, intellektual bacarıq və vərdişlər sisteminə yiyələnməyi, təfəkkürü və əqli keyfiyyətləri inkişaf etdirməyi, idrak motivlərini formalaşdırmağı nəzərdə tutulur. Şagird özünün əqli məziyyətlərini reallaşdırmaq, idrak fəaliyyətini məqsədyönlü tənzim etmək üçün zəruri intellektual bacarıqlara yiyələnməlidir (psixoloji və pedaqoji ədəbiyyatda bəzən bu bacarıqlar daha geniş yönümdə əqli əmək bacarıqları və ya tədris bacarıqları kimi şərh olunur).

İntellektual bacarıqlar çoxsaylıdır. N.A.Mençinskayanın bu sahədəki araşdırmalarını nəzərə alaraq intellektual bacarıqları aşağıdakı qruplara ayırmaq olar: 1.Ümumi intellektual bacarıqlar (planlaşdırma, kitabla iş, özünənəzarət); 2. Psixi fəaliyyətin təşkili üçün zəruri olan intellektual bacarıqlar (mətndə əsas fikri ayırd etmək, mətni mənasına görə hissələrə bölmək, hadisələri tutuşdurmaq və s.); 3. Xüsusi intellektual bacarıqlar (onlar bu və ya digər fənnin xüsusiyyətlərini əks etdirir, məsələn, qrafik bacarıqları). İ.Untun müəllifi olduğu intellektual bacarıqların başqa bir təsnifatı isə belədir: 1.Tədris materialının qavranılması ilə bağlı bacarıqlar ( oxu, müşahidə, dinləmək bacarığı); 2.Tədris materialı ilə məntiqi əməliyyat aparmaq bacarığı (mühüm olanın aid edilməsi, müqayisə, nəticə çıxarmaq bacarığı və s.); 3.Yaradıcılıq bacarıqları (kompozisiya qurmaq bacarığı və s.) (2).

İntellektual bacarıqların başlıca funksiyası fikri əməliyyat eksteriorizasiyası (psixi fəaliyyətə xarici, praktik fəaliyyətin interiorizasiyası, buna müvafiq olaraq, praktik fəaliyyətə daxili, psixi fəaliyyətin eksteriorizasiyası-xarici olana çevrilmə kimi baxılır) ilə əlaqədardır: idrak fəaliyyətinin məzmunu fikri əməliyyatlarla şərtlənir, onların fəaliyyəti prosesində reallaşması isə bilavasitə intellektual bacarıqların səviyyəsindən asılıdır (2), (5).

Təlim prosesinin köklü məsələlərindən olan şagirdlərin intellektual bacarıqlarının

formalaşmasının özünəməxsus xüsusiyyətləri vardır. Qabaqcıl müəllimlər öz təcrübələrinin hikməti ilə onların şagirdlərə aşılanmasına diqqət yetirirlər. Bu öz-özlüyündə fərəh doğurur. Lakin unutmaq olmaz ki, ümumi intellektual bacarıqların, bir tərəfdən, siniflər, digər tərəfdən, ayrı-ayrı fənlər üzrə sisteminin və məzmununun öyrənilməməsi şagirdlərdə onların elmi-metodik ölçülərlə formalaşdırılması prosesinə özünün mənfi təsirini göstərir.

İnsanın özünü dərk etməsi həmişə dünya fəlsəfəsi, psixologiyası və pedaqogikasının aktual problemi olub. Elm xadimləri insanın özünü dərk etməsinə şəxsiyyət yönümündən yanaşıb, onun köklərini insanın öz "Mən"i haqqında təsəvvürlərinin formalaşması prosesində axtarıblar. Təəssüf ki, tədqiqatçılar son dövrlərədək insanın öz ağıl dünyasının, təfəkkür aləminin, koqnitiv proseslərinin xüsusiyyətlərini dərk etməsini kifayət qədər dəyərləndirməyiblər.

Məktəb təcrübəsində də idrak fəaliyyətinin psixologiyası yetərincə öyrənilməyib, şagirdlər özlərinin hafizə və ya təfəkkürünün xüsusiyyətləri ilə maraqlansalar da, onların maraqları təmin olunmayıbdır. Çağdaş Amerika psixologiyasında bu məsələ diqqət mərkəzinə çevrilərək metaidrak sistemi kimi öyrənilməyə başlanılmışdır. Müəyyən edilmişdir ki, uşaqlar inkişaf etdikcə onlarda koqnitiv (idrak) proseslər haqqında müəyyən təsəvvürlər formalaşır və özlərinin əqli fəallıqlarını tənzim etməyə başlayırlar.

Fleyvell metaidrakın bəzi funksiyalarını ətraflı öyrənmiş və təsvir etmişdir. Onlardan aşağıdakıları qeyd etmək olar: 1. Problemin qoyuluşu və onun mümkün həlli yolunun müəyyən edilməsi; 2.Tapşırığın həlli üçün hansı koqnitiv prosesin zəruri olmasını bilmək; 3. İdrak qaydaları və üsullarının aktivləşdirilməsi; 4.Təfəkkürün imkanlarına inam; 5.Tapşırıqları daha səmərəli həll etmək cəhdi. Bu funksiyalar bir-biri ilə qarşılıqlı əlaqədədir. Birinci funksiya uşaqlarda fəaliyyətin məqsədləri haqqında təsəvvürlərin əmələ gəlməsi ilə şərtlənir. Yaş artdıqca onlar məlum yolları müxtəlif situasiyalara tətbiq etməyi öyrənirlər. Tədricən şagirdlərdə koqnitiv proseslər haqqında təsəvvürlər formalaşır. Onlar başa düşürlər ki, materialı yadda saxlamaq üçün müəllimə diqqətlə qulaq asmaq, yada salmaq üçün xatırlamaq lazımdır. Şagirddə bu psixoloji proseslər haqqında təsəvvürlər aydın olanda, o, tapşırığın xarakterindən asılı olaraq bir halda diqqəti, başqa halda hafizəni fəallaşdırır. Bu prosesdə onun səriştəsi tədricən artır. O, məsələni həll etmək üçün yeni-yeni yollar axtarır. Şagird öz təfəkkürünün imkanlarına inananda çətinliklərdən çəkinmir, uğursuzluğa düçar olsa da belə, fikirləşir və məsələni həll etməyə çalışır. Bu prosesdə də onun özünə münasibəti dəyişir. Tapşırığı tələm-tələsik, başdansovdu deyil, səmərəli yollarla həll edir (2).

P. Massen, C. Kencer, C. Koqan və A.Xyustonun fikrincə, qeyd olunan funksiyalar bütün uşaqlarda bu və ya digər dərəcədə inkişaf edir. Lakin onların inkişaf səviyyəsinə tərbiyə şəraiti mühüm təsir göstərir. Metaidrak funksiyaları yaxşı təşkil olunmuş şagirdlər tədris (idrak) tapşırıqlarını planauyğun və məqsədyönlü həll edirlər. Bu funksiyalar uğurlu təlimin (təlim elə fəaliyyətdir ki, onun bilavasitə məqsədi müəyyən məlumatları, hərəkətləri, davranış formalarını mənimsəməkdən ibarətdir) zəruri şərtidir (5). Onları hər vasitə ilə inkişaf etdirmək lazımdır. Məsələnin aktuallığı elmi metodik surətdə bütün aydınlığı ilə dərk edilməli və bu sahədə məktəbdə sistemli iş aparılmalıdır.

Şagirdlərdə intellektual bacarıqların formalaşdırılması məqsədi ilə xüsusi tapşırıqlar sistemi tətbiq olunur. Bu tapşırıqlar müxtəlif intellektual bacarıqların strukturunun modelləşdirilməsi prinsipi əsasında tərtib olunur. Şagirdlər onları yerinə yetirdikcə

öz işinin məqsədini müəyyən etmək, bu baxımdan tədris materialını sistemləşdirmək, müstəqil surətdə material toplamaq, inşa yazmaq və s. kimi intellektual bacarıqlara yiyələnirlər. İnkişafetdirici təlim prinsipi baxımından bu yol səmərəli sayılır. Lakin ondan məqsədyönlü istifadə etmək üçün intellektual bacarıqların siniflər və fənlər üzrə sistemi və məzmunu əsaslı şəkildə işlənilməlidir.

Subyektiv fikrimizə görə, ümumtəhsil məktəblərində tətbiq edilməkdə olan kurikulum modelindən yaradıcılıqla istifadə etməklə (bu, müəllimin elmi-nəzəri hazırlığı və pedaqoji ustalığı ilə şərtlənir) şagirdlərdə intellektual bacarıqların inkişafı məqsədini də hədəfləyən tapşırıqlar sistemini formalaşdırmaq mümkündür. Fikrimizə aydınlıq gətirək.

Kurikulumun struktur elementlərindən olan məzmun standartları fəaliyyət baxımından idraki, emosional və psixomotor bacarıqlara bölünür. Bu bacarıqlar (məsələnin şərtlərinə və qarşıda duran məqsədə müvafiq olan yolları və əməliyyatları düzgün seçmək və onlara nəzarət etmək üçün məlumatlardan istifadə qaydalarını mənimsəmək prosesinin son məhsulu) (5) inkişaf səviyyələri üzrə taksonomiyalarda iyerarxik qaydada yerləşdirilib. Taksonomiyalar təlimi daha ardıcıl və səmərəli qurmaq üçün aşağıdakı imkanları yaradır: təlim məqsədlərini düzgün müəyyənləşdirmək; problemləri düzgün müəyyənləşdirməklə şagirdlər üçün tapşırıqları tərtib etmək; qoyulmuş məqsədlərə uyğun qiymətləndirmə vasitələri seçmək; təlim nəticələrinə əsaslanaraq refleksiyanı düzgün seçmək; bu və ya digər materialın öyrənilməsində şagirdlərin hansı çətinliklərlə qarşılaşdıqlarını müəyyən etmək.

Standartlarda ifadə edilən bilik (bu və ya digər ideal və praktik fəaliyyət növünün müvəffəqiyyətlə təşkil edilməsi üçün aləmin zəruri mühüm xassələri barədə məlumatın mənimsənilməsi prosesinin məhsulu) alt standartlarda dörd kateqoriyadan birini təmsil edir. Biliyin növləri bunlardır: 1. Deklarativ/faktoloji bilik prosesləri və ya fəaliyyət mərhələlərini ehtiva etmir. Müəyyən fənn üzrə məlumat xarakterli biliklərdir. Bunların sırasına artıq mövcud olan mühüm anlayışlar və faktlar, terminologiya və təriflər, hər hansı bilik sahəsini dərk etmək və problemləri həll etmək üçün vacib olan məlumatlar daxildir; 2. Prosedural bilik prosesi ehtiva edir. Bu bilik hər hansı fənn üzrə mühüm vərdiş və proseslər kimi qəbul edilə bilər. Hər hansı fənn və ya bilik sahəsində fəaliyyətin icrasına kömək edən prosedur qaydaları əhatə edən biliklərdir. Bunların sırasına tədqiqat, araşdırma və tətbiqetmə metod və texnikaları, alqoritmlər, xüsusi metodologiyalar daxildir. 3. Kontekstual bilik sadəcə prosedural və ya deklarativ biliyin əsasında qurulan biliyin yeni məzmununu təşkil edir. Konseptual bilik problemin həll edilməsi yolu ilə əldə olunan yeni biliklərdir. Bunların sırasına müəyyən fəaliyyət sahəsinə münasib faktları ümumiləşdirən və əlaqələndirən şəxsin yaratdığı yeni konsepsiyalar, ümumiləşdirmələr, nəzəriyyələr, təsnifatlar, prinsiplər, modellər, strukturlar daxildir. 4. Metakoqnitiv bilik idrak prosesinin gedişatına, idraketmə qabiliyyətinin refleksiyasına və dərk edilməsinə kömək edən biliklərdir. Bunların sırasına problemin həlli və idrak məsələlərinin necə həyata keçirilməsi haqqında strateji və ya reflektiv biliklər, idrak prosesi haqqında təsəvvürlər daxildir (6). Metakoqnitiv bilikləri təfəkkür prosesləri və informasiyalar, onlardan effektli istifadəyə dair biliklər (strateji bilik, koqnitiv vəzifələr haqqında biliklər, o cümlədən uyğun gələn kontekstual və şərti biliklər, özünüdərketmə) kimi qəbul etmək olar.

İdrak taksonomiyası səviyyələr üzrə ümumi təlim nəticələrini, spesifik təlim nəticələrini və fəaliyyət göstəricilərini ehtiva edir, hansı ki, müəllim tapşırıqlar sistemini formalaşdırarkən onlara istinad edir. İdrak takso-

nomiyası aşağıdakı kimi qruplaşdırılmışdır:

Bilik səviyyəsi: Ümumi təlim nəticələri: ümumi terminləri bilir; Spesifik təlim nəticələri: müəyyən edir; təsvir edir; sadalayır; sıralayır; seçir; Fəaliyyət göstəriciləri: yadda saxlamaq; xatırlamaq; tanımaq; işarə etmək.

Anlama səviyyəsi: Ümumi təlim nəticələri: fakt və prinsipləri anlayır; Spesifik təlim nəticələri: fərqləndirir; izah edir; nümunələr gətirir; Fəaliyyət göstəriciləri: izah etmək; bir ifadə vasitəsindən digər ifadə vasitəsinə keçmək; öz sözləri ilə təsvir etmək.

Tətbiqetmə: Ümumi təlim nəticələri: konsepsiya və prinsipləri yeni şəraitdə tətbiq edir; Spesifik təlim nəticələri: dəyişir; hesablayır; istifadə edir; nümayiş etdirir; Fəaliyyət göstəriciləri: problemi həll etmək; müəyyən nəticələr əldə etmək üçün informasiyaları tətbiq etmək.

Analiz: Ümumi təlim nəticələri: işin təşkili strukturunu təhlil edir; Spesifik təlim nəticələri: ayırır; hissələrə bölür; əlaqələndirir; müəyyən edir; Fəaliyyət göstəriciləri: onların bir yerdə necə mövcud olduğunu göstərmək üçün nəyisə parçalamaq; ünsiyyətin əsasını təşkil edən strukturu tapmaq; motivləri müəyyənləşdirmək.

Sintez: Ümumi təlim nəticələri: əşyaları və ideyaları təsnif edərək sxemlər yaradır; Spesifik təlim nəticələri: yaradır; tərtib edir; yazır; nəql edir; Fəaliyyət göstəriciləri: həm şifahi formada, həm də fiziki obyekt ola bilən unikal (yeganə), orijinal (ilkin) məhsulu yaratmaq.

Dəyərləndirmə: Ümumi təlim nəticələri: yazı materialının məntiqi ardıcıllığını qiymətləndirir; Spesifik təlim nəticələri: müqayisə edir; qarşılaşdırır; mühakimə yürüdür; Fəaliyyət göstəriciləri: məsələ haqqında mühüm qərarlar çıxarmaq; mübahisələri və ya fikir müxtəlifliklərini həll etmək (6).

Təqdim olunan ümumi, spesifik təlim nəticələrinə və fəaliyyət göstəricilərinə yönələn fəal dərs üçün tapşırıqların hazırlanmasında təfəkkür növlərinin iyerarxiyası sadədən mürəkkəbə doğru aşağıdakı qayda ilə qurulur: məntiqi təfəkkür-tənqidi təfəkkür-yaradıcı təfəkkür.

Qeyd edək ki, təfəkkürün əməliyyatları onun növünü müəyyən etməyə əsas verir. Bu amildən də təlimin idarə olunmasında faydalanmaq olur. Səriştəli müəllimlər hafizə və təfəkkürün növlərinin iyerarxiyasını sadədən mürəkkəbə doğru qurarkən aşağıda özünə yer alan tələbli tapşırıqlardan istifadə edirlər:

Hafizə: 1. Öyrən; Əzbərlə; Yadına sal; Xəyalında canlandır; Yadında saxla; 2. Danış; İfadə et; Göstər; 3. Tap; Siyahını tərtib et; Sadala; 4. Təsdiqini tap (əsaslandır); 5. Düsturun köməyi ilə hesablayıb tap; Hesabla; 6. Hər hansı bir kateqoriyaya aid et; Göstər; 7. Modelin əsasında tərtib et; 8. Tərif ver və s.

Məntiqi təfəkkür: 1. Təsvir et; Müqayisə et; Oxşarlıqları və fərqləri tap; Təsnif et; 2. Qur; Dəyişdir; Hesabla; Sadələşdir; 3. Müəyyən et; Öz tərifini ver; Əlaqəni aşkar et; 4. Sxem, qrafik, cədvəl düzəlt; Tərtib et; Davam et; 5. Təhlil et; İzah et; Şərh et; Nəticə çıxar; 6. Səbəbi tap (səbəb-nəticə); 7. Ümumiləşdir; Əsas ideyanı seçib ayır; 8. Mahiyyətini, mənasını ifadə et və s.

Tənqidi təfəkkür: 1. Müxtəlif baxış nöqtələrindən qiymətləndir; Əhəmiyyətini, rolunu qiymətləndir; 2. Meyarları müəyyən et; Meyar cədvəlini tərtib et; 3. Səhvləri tap; Faktları uydurmadan seçib ayır; Mübahisəli məqamları aşkar et; 4. Tənqidi yanaş; Düzgün olanı seç; 5. Ən mühüm predmetləri və hadisələri müəyyən et, əhəmiyyətini sübut et; 6. Öz ideyanı əsaslandır (sübut et); 7. Ən səmərəli yolu tap; 8. Məsləhət ver və s.

Yaradıcı təfəkkür: 1. Uydur: hekayə; situasiya; nağıl; musiqi; üsul; 2. Tərtib et, uydur: maket; model; qrafik; kitab; sxem; 3. Proqnoz ver; Müqayisə et və analoqu tap; İxtira et, yarat; Başqa obyektə döndər; Yeni tətbiq üsulunu tap; 4. Dəyişikliklər et, yarat,

yenidən tərtib et; Dəyişikliklər etməklə yarat; Quraşdır; 5. Yeni əsaslar üzərində təsnif et; Yeni şəraitə uyğun hala gətir; Yeni şəraitdə tətbiq et; 6. Öz şəxsi izahını ver; Problemi müəyyən et, fərziyyələr irəli sür; 7. Mübaliğə et; Minimuma endir; 8. Simvol (rəmz) şəklində təsvir et və s.

Tapşırıqlar və onların sistemi: dərsin məqsədinə uyğun və qoyulan tədqiqat probleminin həllinə yönəlmiş olmalıdır (təfəkkürün növünə görə, məlumat mənbələrinə görə, nəticələri təqdimetmə formasına görə və s.); şagirdlərin yaşına, bilik və intellektual səviyyəsinə, qabiliyyətlərinə və maraqlarına uyğun olmalı, diferensial xarakter daşımalıdır; dövlət proqramına və milli dəyərlərə əsaslanmalıdır; aktual, real həyatla və şagirdlərin təcrübələri ilə bağlı olmalıdır; kəşfetmə həvəsini artıran, maraqlı, cəlbedici olmalıdır; dəqiq ifadə edilməlidir; aydın və açıq sualları özündə ehtiva etməlidir.

Tapşırıqlar sisteminin formalaşdırılması təlim prosesində şagirdlərin intellektual bacarıqlarının inkişafını hədəfləyən işin yalnız bir hissəsidir. Mühüm məsələlərdən biri də şagirdlərin tapşırıqlar üzərində işləyərkən idrak fəallığının əmələ gəlməsinə və bütün proses ərzində ( davamlı) saxlanılmasına nail olmaqdır. Diqqət mərkəzində saxlanılmalıdır ki, fəal (interaktiv) təlimin (fəal təlim prosesinin qayəsi tədqiqatdır) dörd əsas mexanizmi idrak fəallığının əmələ gəlməsinə və dərs zamanı saxlanılmasına səbəb olur. Bunlar aşağıdakılardır:

Mexanizm №1. Problem situasiyanın yaradılması (Şagirdin qarşısına problem qoyulur və onun problemi həll etməyə yönəldilməsi nəticəsində idrak fəallığı yaranır); Mexanizm №2. Şagirdin tədqiqatçı, müəllimin fasilitator funksiyasında çıxış etməsi (Fəal/interaktiv təlim zamanı şagird subyekt mövqeyində dayanmalı, bu prosesin bərabər iştirakçısı olmalı, o, bilikləri müstəqil şəkildə tədqiqat zamanı əldə etməlidir). Mexanizm №3. Dialoqun və əməkdaşlığın zəruriliyi (Fəal/interaktiv təlim dialoji şəkildə əməkdaşlıq şəraitində keçirilir). Mexanizm №4. Psixoloji dəstək: hörmət və etibar (Şagirdlərin idrak fəallıqlarını saxlamaq vasitəsi onların psixoloji dəstəklənməsidir, hansı ki, bu, müəllimin xeyirxah münasibəti, şagirdlərə hörmət və etibarı, onların bacarığına inamı sayəsində mümkün olur) (6).

Şagirdin tədqiqatçı mövqeyində çıxış etməsi o zaman mümkün olur ki, təlim materialının məzmunu, vasitə və metodların hərəkət forması ( təlim prosesində təlim materialının məzmunu, vasitə və metodlar təşkilat formasına nəzərən məzmun yerində çıxış edir) tədqiqat prosesinə uyğun olsun. Tədqiqat prosesinə uyğun qurulan təlimin təşkilat formasının özünəməxsus quruluşu vardır (fəal dərsin quruluşu tədqiqat prosesinin mərhələlərini xatırladır).

Fəal dərs adlanan bu forma özündə aşağıdakı mərhələləri ehtiva edir:

1. Motivasiya mərhələsi (problemin qoyulması, fərziyyələrin irəli sürülməsi); 2. Tədqiqatın aparılması mərhələsi (fərziyyələri yoxlamaq üçün faktların axtarılması): 3. Məlumat mübadiləsi mərhələsi (əldə edilmiş məlumatların təqdimatı); 4. Məlumatın müzakirəsi və təşkili mərhələsi (əldə edilmiş məlumatların müzakirəsi, müxtəlif faktların əlaqələndirilməsi, onların sistemləşdirilməsi); 5. Ümumiləşdirmə və nəticələrin çıxarılması mərhələsi (ümumiləşdirmələr, nəticələrin fərziyyələrlə müqayisəsi və onların təsdiq və ya təkzib edilməsi haqqında nəticə, tədqiqat sualına cavab); 6. Produktiv (yaradıcı) tətbiqetmə mərhələsi (yeni şəraitdə tətbiqetmə, praktiki məsələlərin həlli); 7. Qiymətləndirmə və ya refleksiya mərhələsi (fəaliyyətin qiymətləndirilməsi, öyrənməyin qaydalarının mənimsənilməsi, artıq başa çatmış prosesin şüurda inikası, biliklərin mənimsənilməsinin bütün mərhələlərini təhlil etməyə və dərindən başa düşməyə imkan verən başlıca mexanizmlərdən biri) (3).

İntellektual bacarıqların formalaşdırılması

məqsədi ilə tətbiq ediləcək tapşırıqların seçilməsi, sistemə salınması və onların üzərində şagirdlərin fəaliyyətinin təşkil olunmasında aşağıdakı prinsiplər diqqət mərkəzində saxlanılmalıdır:

- təlim prosesinin tamlığı – prosesdə təlim məqsədləri (inkişafetdirici, öyrədici, tərbiyəedici) kompleks həyata keçirilir, o, real nəticələrlə yekunlaşan "müəllim-şagird" fəaliyyətlərini əhatə edir;

- təlimdə bərabər imkanların yaradılması – bütün şagirdlərə eyni təlim şəraiti yaradılır və bu proses onların potensial imkanlarının nəzərə alınması əsasında tənzimlənir;

- şagirdyönümlülük - şagird təlim prosesinin mərkəzində dayanır. Bütün tədris və təlim işi şagirdlərin maraq və tələbatlarının ödənilməsinə, onların istedad və qabiliyyətlərinin, potensial imkanlarının inkişafına yönəldilir;

- inkişafyönümlülük – şagirdlərin idrak fəallığı izlənilir, nailiyyətləri təhlil edilir, bilik, bacarıq və vərdişlərinin inkişaf səviyyəsi tənzimlənir;

- fəaliyyətin stimullaşdırılması – təlimin səmərəli və effektiv qurulması, şagirdlərin təlimə marağının artırılması üçün onların fəaliyyətindəki bütün irəliləyişlər qeyd olunur və dəyərləndirilir, nəticə etibarilə şagirdlərin daha uğurlu təlim nəticələrinə istiqamətləndirilməsi təmin olunur;

- dəstəkləyici mühitin yaradılması– prosesin maddi-texniki baza əsasında və sağlam mənəvi-psixoloji mühitdə təşkil edilməsi keyfiyyətin və səmərəliliyin yüksəldilməsi üçün əlverişli və təhlükəsiz təlim şəraiti yaradır.

*Rəyçi: prof. Ə.Ağayev*

**İstifadə edilmiş ədəbiyyat**

1. Bayramov Ə. Şagirdlərdə əqli keyfiyyətlərin inkişaf xüsusiyyətləri. Bakı: Maarif, 1967.

2. Əlizadə Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı: Pedaqogika, 2004.

3. İbrahimov F., Hüseynzadə R. Pedaqogika. Dərslik. 2 cilddə. Bakı: Mütərcim, 2013.

4. Kazımov N. Pedaqogika (dərslik). Bakı: Maarif, 1996.

5. Ümumi psixologiya (professor A.V.Petrovskinin redaktorluğu ilə). II nəşrdən tərcümə. Bakı: Maarif, 1977.

6. Veysova Z. Ümumi orta təhsil səviyyəsi üzrə yeni fənn kurikulumlarının tətbiqi. Bakı: İnkişaf elmi mərkəzi, 2013.

**Ф.Ибрагимов**

**Регулирование окружающей среды, которая влияет на уровень развития интеллектуальных навыков**

**Резюме**

В статье комментируется интеллектуальные навыки и их главные функции, а также говорится о применении системы специальных задании, с целью их формирования у учащихся. Отмечается что одна из главных задач выявление сознательной активности при работе над этими заданиями, и ее устойчивое сохранение во время всего процесса.

**F.Ibrahimov**

**Factors that influence the development of intellectual skills**

**Summary**

In the article, it is spoken about intellectual skills and their main functions, the implementation of a system of assignments to form students' intellectual skills. İt is noted that, one of the main issues here, is to achieve and maintain students cognitive activeness throughout the whole process while working on those assignments.

***Pedaqogika***

# TARİXLƏŞƏN FAKTLAR MÜASİRLİK SÜZGƏCİNDƏN KEÇİRİLMƏLİDİR

**Asəf Zamanov,**
***Bakı Pedaqoji Kadrların İxtisasartırma və Yenidənhazırlama İnstitutunun direktoru, fizika-riyaziyyat üzrə elmlər doktoru, professor***

Ölkəmizdə həyata keçirilən təhsil siyasətinin mühüm istiqamətlərindən biri də təhsil sahəsində toplanmış potensialı saxlamaq və inkişaf etdirməkdən ibarətdir. Bunun üçün yaxın və uzaq zamanlarda qazanılmış təhsil nailiyyətlərimiz, pedaqoji sərvətimiz, məktəbin qabaqcıl ənənələri, fənlərlə bağlı tarixi təcrübə, eləcə də tarixiliklə müasirliyi birləşdirən milli və bəşərilik müstəvisində harmonik şəkildə birləşən hər hansı təcrübə öyrənilib ümumiləşdirilməli, sistemə salınaraq tarixin möhtəşəm yaddaşına həkk olunmalıdır. Bununla yanaşı, tarixləşən həmin faktlar müasirlik süzgəcindən keçirilərək yeni pedaqoji innovasiyaların əsasına gətirilməli, onların mütərəqqi ənənələr yarada bilən keyfiyyətləri inkişaf etdirilməlidir.

Təcrübə göstərir ki, bütün hallarda təhsil tarixi araşdırılmalı, nəticələr oxucuların fəal mühakiməsinə verilməli, gələcəkdə onların davam və inkişaf etdirilməsi üçün elmi nəticələr çıxarılmalıdır.

“Azərbaycan məktəbi” jurnalının belə bir missiyanı əsas götürərək müəllimlərə kömək məqsədi ilə təhsil tarixinin müasirliklə səsləşən məsələlərinə dair materialları dərc etməsi də bunun bir nümunəsidir. Ona görə də bu məqalədə riyaziyyatın tədrisi tarixinə bir nəzər salmağı lazım bildik.

Bəşər sivilizasiyasının inkişafının bütün dövrlərində riyaziyyatın tədrisinə çox böyük əhəmiyyət verilmiş və bu prosesin uğurlu olması üçün lazımi şərait yaradılmışdır. Bu fənn indi də tədris olunan fənlər içərisində xüsusi yer tutur. Riyaziyyatın tədrisində başlıca məqsəd şəxsiyyətin intellektual inkişafı, dünyagörüşün formalaşması, əqlin gimnastikası, gələcək peşə hazırlığından, həmçinin ali məktəbə hazırlıqdan ibarətdir.

Afinada xüsusi məktəbin - Akademiyanın əsasını qoyan qədim yunan filosofu Platon riyaziyyatı bilməyin hər bir təhsilli insan üçün zəruriliyini nəzərə alaraq, riyaziyyatı tədris fənləri siyahısına daxil etdi, riyazi obyektlərin təyininə xüsusi diqqət yetirdi.

Məktəbin tədris fənlərindən biri olan riyaziyyatın məzmununa hesab, cəbr, riyazi analizin başlanğıcı, müstəvi və fəza, Evklid həndəsəsi, analitik həndəsə, triqonometriya daxil idi. Riyaziyyatın tədrisi gələcəkdə riyaziyyatın, həmçinin yaxın tədris fənlərinin, praktik məsələlərin öyrənilməsi, məntiq və fəza təfəkkürünün inkişafı, yazılı və şifahi riyazi nitq, hesablama vərdişlərinin, cəbri çevirmələrin, tənliklər və bərabərsizliklərin həllinin formalaşdırılması üçün zəruri olan biliklər sisteminin, bacarıq və vərdişlərin şagirdlər tərəfindən mənimsənilməsinə yönəlmişdir.

Tədris fənni olaraq riyaziyyat, riyaziyyat elmindən ancaq həcminə, şərhinin dərinliyinə görə yox, öyrənilən məsələlərin tətbiqi istiqamətinə görə də fərqlənirdi. Riyaziyyatın tədrisi metodikası kursu inkişaf edən riyaziyyat elmi ilə riyaziyyatın stabil

nüvəsi - tədris fənni arasında ziddiyyəti daima aradan qaldırmaq məcburiyyətində qalırdı.

Elmi-texniki tərəqqi riyazi təhsilin məzmununun intensiv olaraq yeniləşməsini, tədris fənninin elmlə yaxınlaşmasını, onun məzmununun cəmiyyətin sosial sifarişinə uyğunluğunu tələb edir.

Tədris fənni kimi riyaziyyatın inkişafının müasir mərhələsi üçün məzmunun əsaslarının ciddi seçilməsi, təlimin konkret məqsədlərinin dəqiq müəyyənləşdirilməsi, fənlərarası əlaqələr, təlimin pillələri üzrə şagirdlərin riyazi hazırlığına tələbatlar, riyaziyyatın inkişafetdirici və tərbiyəedici rolunun gücləndirilməsi; riyaziyyatın həyatla əlaqəsi, riyaziyyat fənninə və onun tətbiqinə şagirdlərin maraqlarının sistematik formalaşdırılması xarakterikdir.

Uşaqlar adi hesablamaların öyrədilməsinə dair məlumatlara dünyada, xüsusilə Avropa ölkələrində Qədim şərq ölkələrinin tarixi barədə mənbələrdə rast gəlir. Riyaziyyat tədrisinin inkişafına, qədim Yunanıstanın riyazi mədəniyyəti mühüm təsir göstərmişdir. Belə ki, hələ bizim eradan əvvəl V əsrdə ticarətin, dənizçiliyin, gəmiçiliyin, sənətkarlığın inkişafı ilə əlaqədar ibtidai məktəblərdə hesab və praktik həndəsə öyrədilirdi. Şagirdlər, həmçinin nəzəri xarakterli həndəsi biliklər alırdılar. Məsələn: məşhur Pifaqor elmi məktəbində onlara isbat öyrədilirdi.

Məktəb riyaziyyat təhsilinin inkişafında orta Asiya alimi Əl-Xarəzminin cəbrdən ilk sistematik kursu mühüm əhəmiyyətə malik idi.

X-XII əsrlərdə Avropa məktəblərinin (Kiyev Rus) ibtidai kurslarına elementar riyazi biliklər daxil edilmişdi.

XII-XIII əsrlərdən Qərbi Avropanın şəhər məktəblərində hesabın elementləri və Evklid həndəsəsi öyrədilirdi. XIV-XV əsrlərə qədər Evklidin kitabı üzrə həndəsə bəzi kolleclərdə və universitetlərdə tədris edilirdi. Bir müddət həndəsə astronomiyanın daha yaxşı başa düşülməsi üçün tətbiq edilirdi. Riyaziyyatın öyrədilməsi şagirdin ümumi inkişafı, həmçinin hərbi sahədə inkişafı məqsədi ilə həyata keçirilirdi. XVI əsrdə praktiki hesab və həndəsə kitabları (tacirlər və sənətkar üçün) dərslik kimi istifadə olunurdu.

XVII əsrin əvvəllərində analitik həndəsənin və riyazi analizin yaradılması tədris fənlərinin məzmununa və tədrisi üsullarına güclü təsir etdi. XVIII əsrin sonlarına yaxın məktəbdə riyaziyyat tədrisi daha da güclənməyə başladı.

Bu dövrdə Riyaziyyat kursunun strukturuna və məzmununa fransız riyaziyyat məktəbi güclü təsir göstərdi. S.Lakrua, A.Klera, A.Lejandr və E.Berunun hesab, həndəsə və cəbrdən müəllimlər üçün yaratdıqları vəsaitlər (учебное руководства: Silvester Fransua de Lakrua “Elementar riyaziyyatdan kurslar” 28.04.1765-24.05.1843, Adrien Mari Lejandr A.lejandr “Həndəsənin başlanğıcı”) məktəb riyaziyyatını elmlə yaxınlaşdırdı.

Rusiyada XIX əsrin əvvəllərində hərbi məktəblər və gimnaziyalar üçün riyaziyyat N.Fuss və astronom C. Y. Rumovskinin iştirakı ilə tərtib edildi.

Gimnaziyaların tədris planlarına cəbr, həndəsə, mexanika və fizika daxil edildi. Riyaziyyatın və tətbiqi riyaziyyatın I-III siniflərdə tədrisinə həftədə 6 saat ayrılırdı. III-IV siniflərdə statistika da öyrədilirdi. Gimnaziyaların yuxarı sinif proqramlarına riyazi analizin başlanğıcı daxil edildi.

1828-ci il Nizamnaməsinə uyğun olaraq gimnaziyalarda real elmlərin tədrisi xeyli zəiflədi, tətbiqi riyaziyyat ləğv edildi, “təmiz” riyaziyyat isə kifayət qədər ixtisar edildi. 15 dekabr 1845-ci il Çirkulyarı “Gimnaziyalarda riyaziyyatın tədrisinin məhdudlaşdırılması” tədris materialının yeni “təyinatını” təklif etdi ki, bu da ilk rəsmi təsdiq edilmiş proqram oldu. Bu proqram riyaziyyat kursunun dəqiq sərhədlərini, siniflər üzrə materialların öyrədilməsinin həcmini və ardıcıllığını müəyyənləşdirdi. Peterburq

riyaziyyat məktəbinin əsasını qoyanlardan biri M. V. Ostroqradskinin rəhbərliyi ilə 1851-ci ildə hərbi məktəblər, 1852-ci ildə gimnaziyalar üçün riyaziyyat proqramı yaradıldı. Gimnaziyalar üçün proqramda məsələ həllinə, fənlərarası əlaqəyə xüsusi diqqət verildi. Xeyli ağırlığına baxmayaraq, bu proqram Rusiyada məktəb riyaziyyat təhsilinin yaranmasında və inkişafında mütərəqqi rol oynadı. P. L. Cebişevin iştirakı ilə tərtib edilmiş riyaziyyatdan vahid stabil ümumdövlət proqramı 1852- ci il proqramından da bir addım irəli getdi. XIX əsrdə beynəlxalq ənənəvi riyaziyyat təhsil sistemi bir qədər də mürəkkəbləşdi. Belə ki, bunlar üçün də xüsusi hesab kurslarının mövcudluğu və qismən həndəsə, hesab, cəbr və triqonometriya müstəqil kurslarının bir-biri ilə qismən əlaqəsizliyi nəzərə çarpırdı.

XIX əsrin sonu XX əsrin əvvəllərində məktəb riyaziyyat təhsilində islahat hərəkatı inkişaf edir. Bu mövcud sistemi ilk dəfə olaraq Rusiyanın və Almaniyanın riyaziyyatçı pedaqoqları tənqid edirlər.

Rus alimi C.İ.Şoxor-Troçkiy elementar və ali riyaziyyatın yeganəliyi məsələsini qoydu. I Beynəlxalq Riyaziyyat konqresində (1897, Surix) alman alimi K.F.Kleyn riyazi təhsil sahəsində islahatın zəruriliyini əsaslandırdı və onun əsas prinsiplərini formalaşdırdı. Rusiyada 1907-ci ildə islahat tərəfdarlarının əsas tələbatlarını əks etdirən real məktəblər üçün proqram işləndi. 1908-ci ildə Rimdə riyaziyyat təhsilinin islahatı üzrə beynəlxalq komissiya yaradıldı. Kleynin rəhbərliyi ilə 19 milli alt komissiyalar yaradıldı. Riyaziyyat müəllimlərinin 1-ci və 2-ci Ümumrusiya qurultaylarında (1911 – 1912, 1913 – 1914, Moskva) məktəb riyaziyyat təhsilinin yeni sisteminin əsası qoyuldu. "Riyaziyyat təhsili" (1912-1917) və "Riyaziyyat xəbərləri" (1914-1917) jurnalları yaradıldı. İslahat tədris fənninin elmlə yaxınlaşmasını, kursların məzmununun yeniləşməsini, fənlərarası geniş əlaqəni, şagirdlərdə funksional-analitik, konstruktiv təfəkkürün formalaşmasını nəzərdə tuturdu. Lakin I Dünya müharibəsi islahat tərəfdarlarına öz ideyalarını həyata keçirməyə imkan vermədi. Mürəkkəbləşən məktəb riyaziyyat təhsilinin rəsmi sistemi, mahiyyətcə, 1917-ci ilə qədər dəyişməz qaldı.

Sovet hakimiyyətinin ilk illərində tamamilə yeni məktəb qurulması məsələsi qoyuldu. Vahid əmək məktəbi təlimatına (qanununa) uyğun olaraq məktəblərin müxtəlif tipliliyi ləğv edildi. Məktəb dövlətin oldu. Sinif dərs sistemi və fənn tədrisi ləğv edildi. Məhsuldar əmək məktəb həyatının əsası elan edildi. 1923-cü ildə kompleks təlim sistemi daxil edildi. "Yay riyaziyyatı", "yaz riyaziyyatı" dərs vəsaitləri meydana gəldi ki, burda da əsas diqqət istehsalat məsələlərinə verilirdi.

Lakin proqramın yoruculuğu, fənlərarası əlaqənin olmaması 10-cu sinif kurslarından analitik həndəsənin və riyazi analizin elementlərinin çıxarılması zərurətini yaratdı, bu bölmələrin əsas mövzuları cəbr kursuna daxil edildi. 1934-cü ildə təsdiq edilmiş proqramlar 1960-cı ilə qədər ciddi dəyişikliklərlə fəaliyyət göstərdi.

Məktəb riyaziyyat təhsilinin səviyyəsi kifayət qədər yüksək, riyaziyyat təliminin məzmunu dayanıqlı oldu.

İyirminci əsrin ortalarında riyaziyyatın inkişafı və onun müxtəlif biliklər sisteminə nüfuz etməsi riyaziyyat təhsilinin məzmununa yenidən baxılmasını tələb edirdi.

I–IV siniflərdə proqramın məzmununda ciddi dəyişiklik edilmədi. XX əsrin ikinci yarısında məktəb riyaziyyat təhsilinin gücləndirilməsi məqsədi ilə beynəlxalq səviyyədə yeni islahat başladı ki, bu da insan fəaliyyətinin çoxlu sahələrdə riyazi metodların rolunun artması, riyaziyyatın tətbiqi əhəmiyyəti və riyazi məntiqin gücləndirilməsi ilə əlaqədar idi. Bu ideyalar əsasında ənənəvi məktəb riyaziyyatının köklü dəyişikliyi həyata keçirildi ki, təhsil prosesində insanın hansı mədəni dəyərlərə malik olmasının xüsusi çəkisi barədə təsəvvürlərin dəyişməsi ilə bağlı idi. Məktəb riyaziyyatının məzmununda "klassik və müasirin" elmə və məntiqə əsaslanaraq qurulmasına cəhd edənlər proqramların dərslik və dərs vəsaitlərinin bir neçə layihəsini təklif etdilər. Şagirdlərin hazır-

lanmasında həm nəzəriyyədə, həm də praktikada diferensial və inteqral hesabını, analitik həndəsəni nəzərdə tuturdu; cəbr və həndəsədə deduksiyaya eyni diqqət yetirilirdi.

Akademik A.N.Kolmoqorovun rəhbərliyi ilə hazırlanmış yeni riyaziyyat proqramı 1969 -1976-cı illərdə məktəbə avtoritar olaraq daxil edildi. Çoxluqlar nəzəriyyəsi və riyazi məntiqin ardıcıl daxil edilməsi riyaziyyat kursunun əsas anlayışlar (ədəd , eynilik çevirmələri, funksiya və s.) ətrafında qruplaşdırılmasına cəhd bu proqramın əsas xüsusiyyətlərindən idi. 4-5-ci siniflər üçün riyaziyyat kursuna hesabın, cəbrin və həndəsinin elementlərini birləşdirən vahid kimi baxılırdı. 6-8-ci siniflər üçün cəbr kursu ədəd, ifadə, funksiya anlayışlarının sistematik formalaşdırılmasına yönəlmişdi. Həndəsə kursunda vektor hesabının elementləri daxil edilmiş, triqonometrik funksiyalarla tanışlıq nəzərdə tutulmuşdur. Cəbr və riyazi analizin başlanğıcı kursunu ( 9 -10-cu siniflər) şərhin riyazi ciddiliyi, riyazi işarələrin geniş istifadəsi fərqləndirirdi. Yeni proqrama keçid bir sıra vacib anlayışların (törəmə, vektor və s.) riyaziyyat təhsilinin məzmununa daxil olmasına, bəzi arxaik məsələlərin (tipik hesab məsələlərinin, adlı ədədlərin sıradan çıxarılmasına) sıradan çıxarılmasına gətirdi.

Lakin didaktik prinsiplərin nəzərə alınmaması, məktəb riyaziyyatının həddən artıq formallaşdırılması riyaziyyat təhsili islahatının arzu olunan nəticələr verməməsinə səbəb oldu, hətta məktəb məzunlarının praktik hazırlığının səviyyəsi aşağı düşdü.

Kütləvi məktəblərdə yeni proqram əsasında tədris göstərdi ki, məktəb riyaziyyat kursunun qurulmasına nəzəri yanaşma yüksək səviyyədə mücərrədliyi ilə fərqlənir, materialın şərhində mürəkkəbliyə, şagirdlərin yorğunluğuna, biliklərdə formalizmə, tədrisin praktikadan ayrılmasına gətirir. Hesablama vərdişləri, elementar cəbri çevirmələrin yerinə yetirilməsi, tənliklərin həlli səviyyəsi aşağı düşür.

Bu göstərilənlər yalnız sovet məktəbi üçün deyil, xaricdə də xarakterik idi. Praktiki olaraq bütün riyaziyyatçı alimlər və pedaqoji ictimaiyyət bu nəticəyə gəldilər. Məktəbdə riyaziyyatın tədrisinin məzmununun normalaşdı rılması istiqamətində iş başladı. Bu işdə İ.M. Vinoqradov, S.M.Nikolski, A.V.Poqorelov, L.S. Pontryaqin və başqaları fəal iştirak edirdilər.

İbtidai məktəblər üçün riyaziyyat proqramı ciddi dəyişikliklərə məruz qalmadı. Həndəsənin elementləri nöqtə, xətt, parça, bucaq, üçbucaq və dördbucaqlılarla, düz xəttin parçalarının və düzbucaqlıların sahələrinin ölçülməsi ilə tanışlıqla təqdim edildi.

Ənənəvi tədris üsullarından başqa didaktik oyunlar və tapşırıqlar geniş istifadə olundu.

Əsas proqramdan və 3 illik, 4 illik məktəblər üçün qüvvədə olan riyaziyyat dərsliklərindən başqa Sovet İttifaqının Rusiya məktəblərində müxtəlif tədris sistemlərində həyata keçirilən eksperimental riyaziyyat dərslikləri ilə iş davam etdirildi. Məsələn: V.V.Davıdovun redaktor olduğu riyaziyyat dərslikləri V.V.Davıdovun ibtidai riyaziyyat kursunda müqayisə və ölçmə prosesində ədədlər yaranan kəmiyyətlərin öyrənilməsi mərkəzi yer tutur. Bu kursda kəmiyyətlər arasında münasibətlərin, xassələrin hərf-işarələnmə yazılışına böyük diqqət ayrılır. Şagirdlərdə nəzəri təfəkkürün inkişafı riyaziyyatın ibtidai kursunun qurulmasına və öyrənilməsinə deduktiv yanaşmanın həyata keçirilməsi əsas məsələ kimi qoyulur.

L. V. Zankov sisteminə uyğun qurulmuş riyaziyyat dərslikləri üzrə iş də onun əsas prinsiplərinə uyğun davam etdirildi: yüksək çətinlik dərəcəsində şagirdlərin təhsili, nəzəri biliklərə xüsusi fikir verilməsi, yüksək sürətlə öyrənmə, şagirdin ümumi inkişafına diqqət və s.

Qeyd etmək lazımdır ki, həmin vaxtlar məktəbəqədər təlim və tərbiyəyə də (ailə) xüsusi fikir verilir. Uşaqlar yaxın-uzaq, böyük-kiçik, kənarda-daxildə və s. anlayışlarla tanış olurlar .

Orta ümumtəhsil və peşə məktəblərinin islahatı ilə əlaqədar orta təhsil sisteminin yenidən qurulması riyaziyyat kursunun dünyagörüş meylliyinin tərbiyəedici təsirinin (məktəblilərdə fənnə dayanıqlı marağın formalaşmasını,

riyaziyyatın praktika ilə kəsilməz əlaqəsi barədə düzgün təsəvvürlərin yaranması, praktiki məsələlərin həllində riyazi üsulların və elmlərin riyaziyyatlaşdırılması rolu haqqında) güclənməsini; şagirdlərin müstəqil fəaliyyətinin rolunun güclənməsini tələb edirdi.

1986-1987-ci tədris ilində riyaziyyat proqramında daxili struktur təkmilləşdi, kurslar yüngülləşdirildi, ayrı-ayrı mövzular və məsələlər tədris illəri üzrə paylandı. 5-6-cı sinif kurslarında əsas diqqət şagirdlərdə hesablama mədəniyyətinin formalaşmasına ayrıldı, tədrisin məntiq komponenti gücləndi. 7-9-cu sinif cəbr kurslarında əsas diqqət şagirdlərdə alqoritmik mədəniyyətin formalaşmasına yetirildi. Əsas cəbri anlayışların şərhi qonşu fənlərdə onların geniş tətbiqinə yönəldi. Cəbr və riyazi analizin başlanğıcı kursunda (10-11-ci siniflər) törəmə və inteqral barədə intuitiv təqdimata, riyaziyyat və fizikanın tətbiqi məsələlərinin həlli üçün tətbiqinə diqqət gücləndi;

real proseslərin təsviri üçün riyaziyyatın tətbiqinə yönəlmiş bəzi məsələlər (riyazi modelləşdirmə barədə anlayış və s.) daxil edildi.

1985-1986-cı tədris ilində informatikanın və hesablama texnikasının daxil edilməsi ilə əlaqədar riyaziyyat proqramında informatikanın öyrənilməsi üçün riyazi bazanın formalaşmasına diqqət artırıldı.

Deyilənlər riyaziyyatdan müasir proqramlar üçün də səciyyəvi oldu (1991,1994). Orta məktəblər üçün Rusiya Təhsil Nazirliyi tərəfindən tövsiyə olunan riyaziyyatdan tipik proqramların iki bölməsi vardı: tipik tədris planı ilə işləyən ümumtəhsil məktəbləri üçün proqram; riyaziyyatı dərindən öyrədən məktəblər (siniflər) üçün proqram. Məktəb riyaziyyat təhsilinin məzmununun sonrakı təkmilləşməsi şagirdlərin riyazi biliklərinin önə çəkildiyi praktikanın tələbatı ilə bağlı oldu: sənaye, istehsal, hərbi iş, kənd təsərrüfatı və s. İyirminci əsrin 90-cı illərində vətən pedaqogikasının inkişafı üçün səciyyəvi olan orta təhsilin humanistləşdirilməsi, demokratikləşdirilməsi, ideologiyasızlaşdırılması da məktəb riyaziyyat təhsilinin məzmununa müəyyən təsir göstərdi. Tədrisin diferensiallaşdırılması ideyası yeni keyfiyyətdə orta məktəblərin ixtisaslaşdırılmasında (xüsusilə yuxarı siniflərdə) meydana çıxdı. Lisey, gimnaziya və kolleclərin – yeni tipli məktəblərin, eləcə də müxtəlif istiqamətli siniflərin (humanitar, texniki, iqtisadi, fizika-riyaziyyat, təbiət və s.) yaranması ilə əlaqədar riyaziyyatdan müxtəlif proqramlar (müxtəlif tədris saatlarına hesablanmış) işləndi, müxtəlif tipli məktəblər üçün proqramlarda öyrənilən (həftədə 3 saatdan 9 saata qədər) məsələlərin müxtəlif nomenklaturası qoyuldu. Məsələn: texniki profilli proqramlarda – oyunlar nəzəriyyəsinin elementləri, xətti proqramlaşdırmanın elementləri, humanitar profilli proqramlarda – ehtimal nəzəriyyəsinin elementləri və s. Müvafiq ixtisaslar üzrə ali məktəblərə qəbul imtahanlarının məzmununa yenidən baxılması problemi də az əhəmiyyətə malik deyildi. Bizim məktəblilərin riyaziyyat sahəsində hazırlığının səviyyəsi dünya ictimaiyyəti tərəfindən yüksək qiymətləndirildi. Riyaziyyatın tədrisi metodikası çex alimi Y.A.Komenski tərəfindən işlənməyə başlanmışdır. Hesabın ibtidai tədrisinin bəzi məsələləri onun "Böyük didaktika" əsərində (1657) şərh edilmişdir.

Riyaziyyatın tədrisi metodikası ilk dəfə İsveçrə alimi İ.Q.Pestalotsinin "ədədlər haqqında əyani təlim" (1803) əsərində metodiki məsələlər XVIII əsrdə və XIX əsrin əvvəllərində, əsasən, dərsliklərdə verilirdi.

Riyaziyyatın tədrisi metodikası üzrə ilk vəsait Rusiyada F.İ.Bussenin "Руководства к преподаванию арифметики для учителей" (1831) kitabı olmuşdur. Xalq məktəbləri üçün hesabın rus metodikasının yaradıcısı metodiki problemlərin həllinin düzgünlüyü kriteriyasının təcrübə və praktika olduğunu etiraf edən P.S.Quryev sayılır.

1950-ci illərdə V.L.Qonçarovun "Алгебра" (müəllimlər üçün kitab), V.M.Bradiş, N.F.Çetveruxina, A.İ.Fetisova və başqalarının metodiki vəsaitləri nəşr edildi. 1960-1980-ci illərdə S.E.Lyapinin redaktorluğu ilə "Методика преподавания математики в восьмилетней школе", Y.M.Kolyagin və "Методика преподавания математики в средней школе",

“Просвещание” nəşriyyatı “Библиотека учителей математики” kitablar seriyasını, riyaziyyatın metodikasının aktual məsələləri üzrə müəllimlər üçün broşur və şagirdlər üçün broşurlar nəşr edilmişdir. Hər bir dərslik üçün müəllimlər üçün kitab, didaktik materiallar, cədvəllər və s. tədris-metodik vəsait komplektləri nəşr olundu.

“Nauka” nəşriyyatı görkəmli riyaziyyatçı alimlərin (S.M.Nikolski, L.S.Pontrayaqin, A.N.Tixonov) müəllimlər və yuxarı sinif şagirdləri üçün bir sıra kitablarını nəşr etdi.

1920-ci ildən sonra Azərbaycanda da riyaziyyatın tədrisinin yeni dövrü başlandı. K.P.Arjenikovoun “Hesab məsələ və misalları”, K.F.Lebedinsevin “Cəbr” kitabları Azərbaycan dilində nəşr edildi. Bu kitablar o zamana qədər istifadədə olunan A.İsrafilbəylinin “Tazə elmül hesab” (1921), Raqibin “Hesab məsələləri məcmuəsi” (1928), İ.Sadıqzadənin “Riyaziyyatdan savad dərsləri üçün məsələlər” (1924) kitabları ilə bir dövrdə tərcümə olunub istifadəyə verilmişdi. Aydındır ki, vəziyyətə görə Azərbaycanda riyaziyyatın tədrisi Rusiya ilə bağlı qurulmalı idi. Görülmüş tədbirlər nəticəsində 1933-cü il Azərbaycanda riyaziyyat dərsliklərinin kəmiyyətcə artması riyaziyyat fənninin tədrisinə də öz təsirini göstərmişdi. 1938-ci ildə “Azərbaycan məktəbi”nin sələfi olan “Müəllimə kömək” jurnalında hesab, cəbr, həndəsə və triqonometriyanın tədrisi proqramı nəşr olundu. Bu proqramlar 1956-cı ilə qədər qüvvədə qaldı. Bu proqramlar əsasında yeni riyaziyyat dərslikləri də yazılırdı.

Bu illərdə Azərbaycanda prof. B.Ağayev, prof. M.Cavadov kimi riyaziyyatın tədrisi ilə məşğul olan alimlər yetişdi. Müstəqillik illərində isə, riyaziyyatın tədrisi özünün yeni dövrünü yaşamağa başladı. XXI əsrin başlanğıcında tətbiq olunan kurikulum islahatları riyaziyyatın tədrisinin yeni mərhələsinin başlanğıcını qoydu.

Heç şübhəsiz, hələ 1927-ci ildən nəşrə başlayan “Математика в школе”, 1954-cü ildən nəşr olunan “Fizika-riyaziyyat tədrisi” jurnalları müəllimlərə çox böyük metodiki kömək göstərmişdir. “Квант” jurnalının da xüsusi rolu danılmazdır.

Riyaziyyatdan sinifdənkənar iş tədrisin fərdiləşdirilməsi formalarından biridir. Fakültativ və dərnək məşğələləri, viktorinalar, müsabiqələr, olimpiadalar, riyaziyyat gecələri, ekskursiyalar şagirdlərin riyaziyyata marağını xüsusilə artırırdı.

Gənc riyaziyyatçılar məktəbləri, qiyabi riyaziyyat məktəbləri, nəhəng universitetlərin nəzdindəki riyaziyyat məktəbləri şagirdlər arasında böyük populyarlığı ilə seçilirdi.

Bütün göstərilənlərə əsaslanaraq hesab edirik ki, riyaziyyatın tədrisinin daha da keyfiyyətlə həyata keçirilməsi üçün müvafiq dövlət proqramının qəbulu mühüm əhəmiyyət kəsb edər.

“Dünyanın məşhur idmançıları futbolçu Pele və Maradona, boksçu Məhəmmədəli, Siciliya mafiyasına qarşı mübarizə aparan kapitan Katani, dünyanın məşhur gülüş ustası Mister Bin və başqaları triqonometriyanın mürəkkəb düsturlarının, törəmənin köməyi ilə funksiyanın araşdırılmasını, inteqral anlayışını və sairəni bilirlərmi?” Bu problemin analizi göstərir ki, riyaziyyat fənninin tədrisinə xüsusi yanaşmaq lazımdır.

Riyaziyyatın dərindən öyrədilməsi məqsədi ilə cəmiyyət üçün yetişdirilən vətəndaşların minimal riyazi biliyə malik olmalarını təmin edən və sadə məntiq məsələləri ilə sintez olunmuş formada hazırlanmış, riyaziyyat dərslikləri və dərs vəsaitləri də yazılmalıdır. Başqa mənada cəmiyyət üçün yüksək intellektual səviyyəyə malik mütəxəssislərin, texniki və iqtisadi sahədə mühəndislərin, elmi işçilərin, müəllimlərin, həkimlərin və digər ixtisas sahiblərinin yetişdirilməsini təmin etməyə və beynəlxalq səviyyədə rəqabət aparmağa qadir olan insan resurslarını yetişdirməyə xidmət etməlidir.

Riyaziyyatın inkişaf tarixindən məlumdur ki, müxtəlif dövrlərdə riyaziyyatın tədrisi ilə bağlı xüsusi məktəblər fəaliyyət göstərmiş, riyaziyyatın tədrisinin inkişaf etdirilməsi ilə bağlı böyük dövlətlər kompleks qərarlar qəbul etmişlər. XX əsrin 60-cı illərində riyaziyyatın tədrisi ilə əla-

qədar SSRİ Nazirlər Sovetinin xüsusi qərarı qəbul edilmş, Moskvada akademik M.A.Lavrentyevin, akademik A.N. Kolmoqorovun riyaziyyat məktəbləri yaradılmışdır. Bir neçə il bundan qabaq ABŞ prezidenti Barak Obamanın ABŞ-da riyaziyyatin tədrisi ilə bağlı xüsusi sərəncamı olmuşdur. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 17 aprel 2006-cı il tarixli sərəncamı ilə "Xüsusi istedada malik olan uşaqların (gənclərin) yaradıcılıq potensialının inkişafi üzrə Dövlət Proqramı (2006–2010-cu illər)" təsdiq edilmişdir. Dövlət Poqramının əsas məqsədi xüsusi istedada malik olan uşaq və gənclərin vaxtında aşkar edilməsi və onlarda bu bacarıqların daha da inkişaf etdirilməsidir. Bu proqramla əlaqədar təhsil müəssisələrində bilik yarışlarının və fənn olimpiadalarının keçirilməsi haqqında Təhsil Nazirliyinin müvafiq qərarları qəbul edilmişdir. Qeyd etmək yerinə düşər ki, riyaziyyat olimpiadalarının təşkilində fundamental riyaziyyatın, nəzəriyyənin – həndəsi qurmaların və isbat məsələlərinin daxil edilməsi ümumi işin xeyrinə olardı. Danılmaz faktdır ki, elm, texnika, informasiya-kommunikasiya texnologiyaları və iqtisadiyyat sahəsində inkişafa məhz klassik riyaziyyatın köməyi ilə nail olunmuşdur.

Son illərdə müstəqil Azərbaycan Respublikasının texniki və iqtisadi cəhətdən daha da inkişaf etməsi, möhtərəm prezidentimiz İlham Əliyevin müvafiq Sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın tələblərinə uyğun olaraq insan resurslarının formalaşması, gənclərin yüksək səviyyədə təhsil alması, peşəkar mütəxəssis və əsl vətəndaş kimi hazırlanması üçün riyaziyyatın tədrisinin daha keyfiyyətlə həyata keçirilməsinə səbəb olan konsepsiyanın hazırlanması mühüm əhəmiyyət kəsb edərdi.

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasında təhsilin inkişafi üzrə Dövlət Strategiyası.// Azərbaycan məktəbi, 2013, №5.

2. Abbaszadə A. Azərbaycanda fizika-riyaziyyat və təbiət elmlərinin tədrisi metodikasının inkişafina dair.// Azərbaycan məktəbi, 1960, №4.

3. Qaralov Z. Təhsil sisteminə müasir baxış. Bakı: Pedaqogika, 2003.

4. Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulum). Bakı, 2006.

5. Ağayev V. Azərbaycan sovet məktəbində riyaziyyatın tədrisi tarixinə dair. Bakı: Azərnəşr, 1964.

6. Cavadov M. Orta məktəbdə riyaziyyat tədrisinə aid qeydlər.//Azərbaycan məktəbi, 1949, №3.

7. Hacıbəyli Ü. Hesab məsələləri. Bakı: Orucov qardaşları çapxanası, 1907.

8. Mehdizadə M. Azərbaycanda sovet məktəbinin tarixinə dair xülasələr. Bakı: Azərnəşr, 1958.

10. Zamanov B., Hüseynova N. Fənlərin tədrisi və problemlər: reallıqlar, perspektivlər//. Azərbaycan məktəbi, 2011, №6.

11. Школьная энциклопедия. Москва, 2003.

12. Математика в школе. Научно-теоретический и методический журнал. 2009-2014.

**А.Заманов**

**Факты истории фильтруются современностью**

**Резюме**

В статье говорится об истории обучения математики в общеобразовательных школах.

**A.Zamanov**

**The facts of history are filtered modernity**

**Summary**

In article deals about history of teaching of mathematics in secondary schools.

# ÜMUMİ TƏHSİLİN MƏZMUNUNUN MÜƏYYƏNLƏŞDİRİLMƏSİ: MÜHÜM DİDAKTİK PRİNSİPLƏR

**Məhbubə Məmmədova,**
**"Tərəqqi" liseyinin direktoru,**
**əməkdar müəllim**

***Açar sözlər:*** *ümumi təhsilin məzmunu, didaktik prinsiplər, ümumi təhsilin məzmununun nəticəyönümlülüyü, ümumi təhsilin məzmununun şəxsiyyətyönümlülüyü, kommunikativliyin təmin olunması.*

***Ключевые слова:*** *содержание общего образования, дидактические принципы, результативность содержания общего образования, склонность на личность в содержании общего образования, обеспечение коммуникативности.*

***Key words:*** *content of general education, didactik principles, result-oriented education, and personality oriented education, providing communicativeness.*

Təhsil sosial hadisə kimi özünün önəmli xüsusiyyətləri ilə cəmiyyətin bütün problemlərinin yaranmasında ciddi məsuliyyət daşıması ilə fərqlənir. Dünyanın inkişaf etmiş ölkələri cəmiyyətin problemlərinin həll olunmasına məhz təhsil müstəvisindən başlamaqla özlərinin fəaliyyətlərini qururlar. Təcrübə göstərir ki, belə bir yanaşma tərzinə normal hal kimi baxılmaqla təhsil problemlərinin həll olunmasına təşəbbüs göstərirlər. Təhsil problemlərinin həll olunmasında isə onun müxtəlif tərəflərdən inkişaf etdirilməsi mümkün hesab edilir. Təcrübələr göstərir ki, bu tərəflər arasında ən həssas olan təhsilin məzmunu başlıca olaraq onun seçilməsi prinsipləridir. Bu sahədə kifayət qədər tədqiqat aparılmasa da o, özünün əhəmiyyətli bir nöqtə olması ilə daha qabarıq görünür və istər-istəməz tədqiqat aparanların marağına səbəb olur.

Aparılan araşdırmalarda ümumi təhsilin məzmunu ilə bağlı əldə olunmuş qənaətlərə istinad etməklə hazırkı şəraitdə Azərbaycanda gedən sürətli dəyişiklikləri nəzərə almaqla onun məzmununun aşağıdakı prinsiplər əsasında müəyyənləşdirilməsi mümkündür:

- Ümumi təhsilin məzmununun humanistləşdirilməsi.
- Ümumi təhsilin məzmununun cəmiyyətin inkişaf tələblərinə uyğunluğu.
- Ümumi təhsilin məzmununun müxtəlif səviyyələrdə formalaşdırılmış struktur cəhətdən vahidliliyi.
- Ümumi təhsilin məzmununun nəticəyönümlülüyü.
- Ümumi təhsilin məzmununun şəxsiyyətyönümlülüyü.
- Ümumi təhsilin məzmununun inteqrativliyi.
- Ümumi təhsilin məzmununun formalaşdırılması zamanı milli və bəşəri dəyərlərin nəzərə alınması.
- İnformativliyin və kommunikativliyin təmin olunması.
- Kreativliyin və çevikliyin nəzərə alınması.

Bu prinsiplərin şərhi üzərində ayrıca dayanmağı lazım bilirik: **Ümumi təhsilin məzmununun humanistləşdirilməsi.** Bəşə-

riyyət yarandığı dövrdən daimi özünün inkişafını zəruri bir problem kimi həll etmək üçün düşünülmüş, tarixi bir ənənəsi olan təhsil sistemi yaradılmışdır. İnsanların inkişafını təmin etmək məqsədi daşıyan təhsil mahiyyətcə humanist xarakterli bir sistem kimi dəyərləndirilmişdir. Müxtəlif zamanlarda cəmiyyətin inkişaf tendensiyasından asılı olaraq təhsil sistemində formalaşmış olan inzibatçılıq onun humanist xarakterinin zəifləməsi ilə nəticələnmişdir.

Zaman keçdikcə təhsildə demokratik əhvali-ruhiyyənin güclənməsi eyni zamanda təhsilin humanistləşdirilməsinin daha geniş miqyasda yayılması ilə nəticələnmişdir. Prof. Ə.Əlizadənin fikrincə, "əgər şagird inkişaf etmirsə, müəllim-şagird münasibətlərinin humanistləşdirilməsi ancaq və ancaq təntənəli sözlər kimi səslənə bilər... Təhsilin humanistləşdirilməsi konsepsiyasının ana xətti inkişaf anlamı ilə bağlıdır". Buradan belə bir analoji nəticə çıxarmaq olar ki, ötən əsrin inkişafetdirici təlimi humanistləşdirmənin yaranmasına rəvac vermişdir. Artıq 1999-cu ildə ölkə miqyasında qəbul olunmuş "Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı"nda humanistləşdirmə ölkə miqyasında keçirilən təhsil islahatının əsas prinsiplərindən biri kimi qəbul olunmuş və islahatçılıq fəaliyyətinin əsasına gətirilmişdir. Ölkəmizdə qəbul olunmuş və bu gün təhsil quruculuğu sahəsində fəaliyyətimizin əsasını təşkil edən "Təhsil haqqında" Azərbaycan Respublikasının Qanununda da humanistləşdirmə təhsil sahəsində dövlət siyasətinin əsas prinsiplərindən biri kimi qəbul olunmuşdur. Onun mahiyyəti və məzmunu belə təsbit edilmişdir: "humanistlik - milli və ümumbəşəri dəyərlərin, şəxsiyyətin azad inkişafının, insan hüquqları və azadlıqlarının, sağlamlığın və təhlükəsizliyin, ətraf mühitə və insanlara qayğı və hörmətin, tolerantlıq və dözümlülüyün prioritet kimi qəbul olunması" (2).

Ölkənin təhsil qanunundakı bu yanaşma bütün pillələrdə olduğu kimi, ümumi təhsilə də aid olmaqla onun mövcud durumunun mühüm keyfiyyətlərindən birini konkretləşdirir. Bu, haqqında bəhs etdiyimiz humanistləşdirmədir ki, onun aparıcı tələblərindən biri şagird şəxsiyyətinə münasibətdə təzahür edir. Şagirdə daim inkişaf edən və düşünən varlıq kimi yanaşmaq, onun potensial imkanlarının meydana çıxmasına təkan vermək, cəmiyyətin gələcək vətəndaşı kimi onu xidmət və qayğı ilə əhatə etmək onun mühüm atributları kimi diqqət mərkəzində dayanır.

İlk növbədə təhsilin məzmununa çoxlu sayda material daxil etməklə onu zəngin informasiyalar mənbəyinə çevirmək deyil, şagird şəxsiyyətinin inkişafında praktik əhəmiyyətliliyi ilə yer tutan ən zəruri məlumatların əks olunduğu və şagird fəaliyyətinin istiqamətlənməsinə imkan yaradan vasitəyə çevirmək tələb olunur. Haqlı olaraq prof. Ə.Əlizadə özünün psixopedaqoji araşdırmalarında belə qənaətə gəlir ki, "90-cı illərdə təhsilin humanistləşdirilməsi ideyaları kontekstində təhsilin məzmununun müəyyənləşdirilməsi sahəsində yeni önəmli meyar - şəxsiyyət meyarı əmələ gəlmiş və bərqərar olmuşdur" (2). Müasir zamanda bu məsələyə baxış inkişaf etməklə xeyli dəyişmişdir. Müasir pedaqoqların qeyd etdiyi kimi "indiki şəraitdə, bütöv insan şəxsiyyətinin inkişafı, insanın özünün özünə qaytarılması təhsilin məzmununun müəyyənləşdirilməsində həlledici ideya kimi xüsusi əhəmiyyət kəsb edir" (3).

Təhsil bütün hallarda özünün inkişaf etdirmək funksiyası ilə maraq doğurub. O, uşağa müəyyən anlayışların öyrədilməsi prosesində, eləcə də tərbiyə zamanı şagirdin inkişaf istiqamətində dəyişikliyə təsir göstərməsini bir an da olsa, dayandırmamışdır. Həmişə şagirdin irəliyə doğru inkişafına imkan yaratmış, onun təşkilatçısı olmuşdur

ki, bu zaman inkişaf prosesində hafizə məkanında hərəkət etmək, daha çox yaddaşın potensial imkanlarını genişləndirmək prioritet hesab olunmuşdur. Lakin bu gün inkişaf anlayışının əhatə dairəsində əqlin, təfəkkürün, idraki bacarıqların formalaşdırılması missiyası dayanır. Bununla humanist bir tendensiyanın, yanaşma tərzinin əsası qoyulur.

Ümumi təhsildə şagird təfəkkürünün inkişaf etdirilməsi, onu ümumiləşdirmək, analiz, sintez aparmaq, təsnif etmək, mücərrədləşdirmək, konkretləşdirmək kimi təfəkkür fəaliyyətinin müxtəlif növlərinə dair bacarıqların mənimsənilməsi humanist yanaşmanın əlamətdar cəhətlərindən biri olmaqla yeni təhsil sisteminin mühüm cəhəti hesab edilir.

Ümumi təhsildə şagirdin təlim yükünün azaldılması, onun daha çox maraq effekti kimi uşaqların diqqətində canlandırılması, mənimsənilmiş bilik və bacarıqların tətbiq imkanlarına malik olması və bunların qabiliyyətlərə çevrilməsi onun humanist prinsiplərə nə dərəcədə əsaslanmasını göstərir. Ümumi təhsilin məzmununun humanist prinsiplər əsasında qurulması onun artıq biliklərdən azad olunmasına imkan yaratmaqla, tətbiq bacarıqlarının genişlənməsi üçün geniş yol açır.

Yeni təhsil quruculuğunda ümumi təhsilin məzmununun bilik, bacarıq və qabiliyyətlərdən ibarət nəticələr formasında hazırlanması həm də şagirdlərdə dəyərlərin formalaşdırılmasına imkan yaradır.

**Ümumi təhsilin məzmununun cəmiyyətin inkişaf tələblərinə uyğunlaşdırılması.**

Cəmiyyətin zaman-zaman ardıcıl olaraq inkişaf etməsi, irəliləməsi, təbii olaraq, öz daxilində olan bütün sahələrin dəyişərək onun ehtiyac və tələbatlarına uyğun olmasını vacib şərt kimi qarşıya qoyur. İstər siyasi, istər iqtisadi, istərsə də mədəni aləmdə baş verən dəyişikliklər onun inkişaf tempinin təzahürü kimi meydana çıxır.

Təhsilin məzmunu, ilk növbədə cəmiyyətin elmi-texniki, eləcə də müxtəlif elm və fəaliyyət sahələrinin inkişaf tendensiyasına cavab verməli olur. Bu təhsilin inkişafetdirici funksiyasının başlıca tələbi olmaqla mühüm zərurət kimi meydana çıxır. Məzmunun hər zaman yeni olması və yeniliyi təmsil etməsi onun maraq effektinin yaranmasında başlıca rol oynayır. Bu əsas etibarilə o məntiqdən irəli gəlir ki, yeni olan diqqəti cəlb edir. Onda maraq effektinin olması ehtimalı daha güclü olur. Şagirdlər yeni olan anlayışları, qanun və qanunauyğunluqları, fəaliyyətləri daha çox izləyir, onlara diqqət yetirirlər.

Müasir dünyanın inkişaf tendensiyası yeni fəaliyyətlərin formalaşması və geniş yayılmasına daha çox yön almışdır. Bu gün texnologiyalar cəmiyyətin çevik hərəkətverici qüvvəsi kimi dünyanın hər yanında yayılmaqdadır. Bu isə özlüyündə böyük bir inkişaf sürətinə çevrilməklə bəşəriyyətin təhsil almasında mobilliyin yaranmasına təsir göstərməkdədir. Təhsil özünün məzmununda bütün bu inkişafı təmin edən texnologiyaları ehtiva etməklə onu cəmiyyətin üzvlərinə ötürür, onları cəmiyyətin inkişaf tələblərinə hazırlamaq missiyası ilə çıxış edir.

Bu gün müasirliyi ilə daha çox maraq doğuran nəticəyönümlü məzmun konkret müəyyən dövrdə sabit olur. Dövrü olaraq onun yeniləşməsi, cəmiyyətin inkişaf tələblərinə uyğun olaraq yeni mahiyyət və məzmun daşıması normativ tələb kimi davam etdirilir.

**Ümumi təhsilin məzmununun müxtəlif səviyyələrdə formalaşdırılmış struktur cəhətdən vahidliliyi.**

Ümumi təhsil bir pillə kimi özündə müxtəlif səviyyələri birləşdirir. İbtidai təhsil onun ilk, ümumi orta ikinci, tam orta təhsil isə onun üçüncü səviyyəsi hesab edilir. Təbii ki, bu üç səviyyə təhsilin ümumi strukturunda olmaqla, onların hər biri özünəməx-

susluğu ilə fərqlənir. İlk növbədə onlar başlıca olaraq məqsəd və vəzifələrinə, eləcə də daşıdıqları məzmuna görə fərqlənir. Eyni zamanda onlar müxtəlif yaş dövründə olan uşaqların tələbat və ehtiyaclarını ödəmək zərurəti qarşısında qaldıqlarından spesifik məzmunla yanaşı, özlərinə xas olan təlim texnologiyaları ilə seçilirlər. Bunlar ümumi təhsil pilləsinin səviyyələrinin təbii olaraq özünəxas keyfiyyətlərə malik olmasını göstərməklə onlara orijinallıq, özünəməxsusluq gətirir. Eyni zamanda bu səviyyələrin fərqli pedaqoji strukturlar kimi təqdim olunmasını təmin edir.

Bütün bunlarla yanaşı, ümumi təhsilin vahid bir təhsil pilləsi kimi keyfiyyətlərə malik olması inkar edilmir. Bu mənada ümumi təhsilə aid olan bu keyfiyyət həm də onun məzmununa da aid olur. Odur ki, ümumi təhsilin müxtəlif səviyyələrdə formalaşdırılmış məzmunun struktur cəhətdən vahidliliyi mühüm prinsiplərdən biri kimi qəbul edilməklə yanaşı, eyni zamanda bir anlayış olmaqla məzmunun struktur cəhətdən vahidliliyi barədə mülahizələri də aydınlaşdırmaq pedaqoji cəhətdən faydalı hesab edilir.

**Ümumi təhsilin məzmununun şəxsiyyətyönümlülüyü.**

Qlobal dünyanın təhsil sistemində gedən dəyişikliklərin mühüm istiqamətlərindən biri onun humanist mahiyyət daşımasından, şəxsiyyətin meyil və maraqlarına yönəlməsindən ibarətdir. Azərbaycanda aparılan təhsil islahatlarında da "təhsilalanın şəxsiyyət kimi formalaşdırılmasını, onun təlim-tərbiyə prosesinin əsas subyektinə çevrilməsini başlıca vəzifə hesab edən, bütün qurumların fəaliyyətini təhsilalanın mənafeyinə xidmət etmək məqsədi ətrafında birləşdirən yeni bir sistemin yaradılması" ciddi bir vəzifə kimi qarşıya qoyulur. Bu vəzifə, ilk növbədə təhsilin, o cümlədən ümumi təhsilin məzmununda şəxsiyyətin inkişafını nəzərdə tutan təminedici məzmunun yaradılmasını tələb edir.

**Ümumi təhsilin məzmununun inteqrativliyi.**

Müasir zamanda inteqrasiya anlayışı haqqında yeniliyin atributu kimi danışılsa da, onun çox qədim bir tarixi vardır. Həyat yarandığı dövrdən inteqrativ keyfiyyətlərinə görə daha çox maraq doğurub, diqqəti cəlb edib. İnsan özünün, demək olar ki, bütün nailiyyətlərinə inteqrativ düşüncə tərzi vasitəsilə nail olub. Müxtəlif obyektlər arasındakı əlaqələri müəyyən etməklə, eləcə də özünün oxşar subyektiv mülahizələrinin fonunda yeni kəşflər etməklə uğurlar qazanıb. Bütün bunlar isə inteqrativliyin daha çox elmi yanaşmaların əsasında duran və obyektiv xarakter daşıyan bir xüsusiyyət olmasını meydana çıxarır. O cümlədən inteqrativliyin təhsilə aid olması sadə bir məntiqdir. Xüsusən təhsilin məzmununda inteqrasiyanın olması, onun hər hansı bir məqsəd ətrafında bitkin, həm də bütöv bir təhsil sisteminin komponenti kimi formalaşması həmişə məktəblə məşğul olan insanları düşündürmüşdür. Təhsilin məzmununa aid araşdırmalarda bu baxımdan maraqlı nəticələr vardır. Ən başlıcası inteqrativ kurikulumların kökü ilə bağlı qənaətdir: "İnteqrativ kurikulumun kökü qədim yunan filosofu Aristotelə gedib çıxır. Aristotel "Etika və siyasət" əsərində fikirlə əməli, düşüncə ilə fəaliyyəti birləşdirməyin nəzəri əsaslarını işləyib hazırlamışdır. Aristotelin bu konsepsiyası orta əsrlər Avropa təhsilinə həlledici təsir göstərdi və orta əsr universitetlərində akademik fəaliyyətin mahiyyətini təşkil edən "incəsənət və metodların" mahiyyətini təşkil etdi" (4).

Bu yanaşma sonralar da cəmiyyətin təhsil hadisəsinin mühüm əlamətlərindən biri kimi davam etdirilmişdir. "Sonrakı dövrlərdə klassik pedaqoqların Y.A.Komenskinin, A.Disterverqin, K.D.Uşinskinin əsərlərində və ya dərsliklərində şagirdlərin inteqrativ təfəkkürünün inkişafına imkan verən tədris

materialları, yəni onların nitqinin lüğət ehtiyatlarının artmasına, həm də təbiət, ətraf aləm haqqında biliklərin zənginləşməsinə kömək edən şərtlər öz əksini tapmışdır" (5).

Bu gün təhsil əsri kimi qəbul edilmiş XXI əsrdə də inteqrasiya müasir təhsilin əsas əlaməti kimi qalmaqdadır. Ən yeni texnologiyalarla zəngin olan bu əsrdə inteqrasiyadan bəhs olunarkən, ilk növbədə onu əsas prinsip kimi qəbul etməklə mahiyyətində daha çox əlaqələrin, qoşulmanın, qovuşmanın olduğu göstərilir. "İnteqrasiya-milli təhsil sisteminin dünya təhsil sisteminə səmərəli formada qoşulması, uyğunlaşması və qovuşması əsasında inkişafı"(1) kimi dəyərləndirilir. Daha geniş məzmuna malik təhsil anlayışına aid olan inteqrasiya onun bütün struktur elementlərinə şamil edilir.

Bu isə o deməkdir ki, inteqrasiya həm də təhsilin məzmununun qurulmasında nəzərə alınması zəruri olan bir prinsipdir. Araşdırmaların məntiqinə uyğun olaraq biz analoji olaraq ümumi təhsilin məzmununda inteqrasiyanın vacibliyini qeyd edirik.

Ümumi təhsilin səviyyələri özlüyündə ayrı-ayrı məqsəd daşısa da, onlar ümumi təhsil məqsədi daşıması baxımından vahid bir ideyaya xidmət göstərirlər. Burada ibtidai təhsildən başlayaraq tam orta təhsilə qədər məzmunun məntiqində ümumidən xüsusiyə doğru bir istiqamətin müəyyənləşdirildiyi aydın görünür. Bu isə parlaq şəkildə fənlərin sayında öz ifadə tərzini tapır. Belə ki, ibtidai siniflərdə 9, ümumi orta təhsildə 15, tam orta təhsildə isə 17 fənnin tədris olunması nəzərdə tutulur.

Ümumi təhsilin məzmununda inteqrasiya ilkin olaraq səviyyələr üzrə məqsədlərin, eləcə də ümumi nəticələrin müəyyən olunması üçün vacib hesab edilir. Nəticələrdə zəruri biliklərin və şagirdlərə aşılanacaq fəaliyyətlərin birləşdirilməsi məhz inteqrasiya prinsipinə əsasən həyata keçirilir.

Bu gün təhsilə kultroloji yanaşma tərzi onun məzmununun mədəniyyətlərə əsaslanan dəyəryönümlü xarakter daşımasını tələb edir. Şagirdlərin bir şəxsiyyət kimi formalaşması üçün onlarda nitq mədəniyyəti, təfəkkür mədəniyyəti, fiziki mədəniyyət, estetik mədəniyyət, ekoloji mədəniyyət kimi dəyərlərin formalaşdırılması didaktik vəzifə kimi meydana çıxır. Dəyərlər isə insan fəaliyyətini tənzimləyən mühüm keyfiyyətlər kimi özündə həm də zəruri bilikləri, bacarıq və qabiliyyətləri ehtiva edir. Onlar inteqrasiya prinsipinə istinad olunmaqla yaranır. Eyni zamanda təlim prosesində müəllimin inteqrativ yanaşma tərzini tələb edir.

Təhsil prosesinin keyfiyyəti həm də əlaqələrin səmərəli qurulmasından asılı olur ki, bu da kurikulumlarda fənlərin öz daxilində, həm də fənlər arasında olan əlaqəliliyin gözlənilməsi ilə tənzimlənir.

Ümumi təhsilin məzmununda, inteqrasiyanın nəzərə alınmasında onun həm üfüqi, həm də şaquli növlərindən istifadə olunması da didaktik əhəmiyyət daşıyan məsələ kimi dəyərləndirilir.

**Ümumi təhsilin məzmununun formalaşdırılması zamanı milli və bəşəri dəyərlərin nəzərə alınması.**

Müasir dünyada qurulan təhsilin başlıca keyfiyyətlərindən biri onun dəyəryönümlü olması, təhsilalanları gələcəyin vətəndaşı kimi yetişdirmək üçün onlarda ən yüksək insani keyfiyyətlərin formalaşdırılmasından ibarətdir. O, ilk növbədə özünün ən zəruri milli xüsusiyyətlərini daşımaqla, eyni zamanda, ümumbəşəri keyfiyyətlərə də yiyələnməlidir. Qloballaşan dünyada insanların, ölkələrin, xalqların, millətlərin əlaqə və ünsiyyətinin çoxaldığı bir zamanda hər bir təhsilalan, o cümlədən ümumi təhsilini başa vuran hər kəs üçün bu, vacib bir sosial tələb hesab edilir.

**İnformativliyin və kommunikativliyin təmin olunması.**

Ümumi təhsilin məzmunu bir bütöv

halında bilik, bacarıq və qabiliyyətləri əhatə edir. Orada ən zəruri hesab edilən müəyyən qrup anlayışlar ümumiləşir. Təbii ki, bu, şagirdlərin əldə edəcəkləri dəyərlərin fonunda müəyyənləşir. Elmlərin müxtəlif sahələrinə aid olan bu anlayışlar özlüyündə deklorativ xarakter daşımaqla praktik əhəmiyyətlilik baxımından seçilərək qruplaşdırılır. Onların seçilməsində və təlim baxımından dəyərləndirilməsində şagird şəxsiyyətinin inkişaf etdirilməsi, formalaşdırılması əsas tələblər kimi götürülür. Həmin anlayışların, istərsə də qanun və qanunauyğunluqların ilkin olaraq informasiya kimi təhsilin məzmununun mühüm bir komponenti kimi mövcud olması zəruri hesab edilir. Şagirdlər üçün nəzərdə tutulmuş bu informasiyaların seçilməsi və məzmun komponenti kimi formalaşdırılması ümumi təhsilin məzmununun informativliyinə təminat verir.

Ümumi təhsilin məzmununun informativliyi zəruri biliklərin nəzəri bazasını təşkil etməklə bacarıq və qabiliyyətlərin əmələ gəlməsinə şərait yaradır. Şagirdlər həmin informasiyaları öyrənməklə özlərinin baza biliklərini möhkəmləndirmiş olurlar. Yaxud şagirdlər özlərinin baza biliklərini möhkəmləndirmək üçün uyğun informasiyaları toplamağa ehtiyac hiss edirlər. Belə olduğu təqdirdə təhsilin məzmunu özünün zəruri informasiya blokunun zənginliyi ilə həmin ehtiyaclara cavab vermək zərurətində qalır. Beləliklə, şagirdlərin zəruri biliklərə olan ehtiyacının ödənilməsində ümumi təhsilin məzmunu özünün informativ xarakteri ilə çıxış etməli olur.

Kommunikativ mədəniyyət şəxsiyyətin ümumi mədəniyyətinin mühüm tərkib hissələrindən biridir. Onun vasitəsilə şəxsiyyət başqalarına münasibət göstərməklə özünün ünsiyyət bacarıqlarını meydana çıxarır. Ümumiyyətlə, cəmiyyətin xaosdan uzaq olması kommunikativ bacarıqlara yiyələnməklə əldə olunur. İnsanlar kommunikativ bacarıqlara yiyələnməklə özlərinin normal, iqtisadi, sosial, mədəni həyatını qurmuş olurlar.

Bəs onda cəmiyyət üçün zəruri olan bu keyfiyyətin əldə olunması üçün nə etmək lazımdır? Başqa sözlə, yetişən gənc nəslin kommunikativ bacarıqlarını hansı müstəvidə formalaşdırmaq faydalı hesab edilə bilər?

Əldə olunmuş təcrübələrə əsasən belə nəticəyə gəlmək mümkündür ki, insanın formalaşmasında həlledici rol oynayan kommunikativ bacarıqların məhz ümumtəhsil məktəblərində formalaşdırılması şəksizdir. Bütövlükdə ümumi təhsil əlaqə və ünsiyyətlərə söykənən kommunikativliyin yaradılmasında aparıcı rol oynayır. Bəzi hallarda insanların xarakterinin formalaşmasında çox əhəmiyyətli rol oynayan kommunikativlik müasir ümumi təhsil müstəvisində xüsusi əhəmiyyət daşıması ilə fərqlənir. Bu cəhətin isə reallaşdırılmasında ümumi təhsilin məzmunu potensial imkanları ilə daha çox diqqəti çəkir. Bu isə o deməkdir ki, ümumi təhsilin yeni məzmununun yaradılmasında bu məsələyə xüsusi önəm verilməsi özünün didaktik əhəmiyyəti ilə seçilir.

Ümumi təhsilin yeni məzmunu da elə praktik mövqedən hazırlanmalıdır ki, orada şagird maraqları nəzərə alınsın. Onların kommunikativ bacarıqlarının inkişaf etdirilməsinə şərait yaradılsın.

**Kreativliyin və çevikliyin nəzərə alınması.**

Ümumi təhsilin yeni məzmununun yaradılmasında kreativliyin və çevikliyin nəzərə alınması da mühüm prinsiplərdən hesab edilir. Yeri gəlmişkən, təhsil əsri hesab edilən XXI əsrdə insan idrakının inkişafı, düşüncəsinin formalaşması prioritet hesab edilir. Bu günün insanı, hər şeydən əvvəl, kreativ bacarıqları ilə fərqlənir. O, yaradıcı bir insan kimi cəmiyyətin hər

hansı bir nöqtəsində özünün əvəzolunmaz missiyasını yerinə yetirir. Kreativ keyfiyyətləri ilə cəmiyyətin fövqündə dayanır.

Şagirdlərin kreativ bacarıqlarının formalaşması onun intellektual səviyyəsinin artması analiz, sintez, müqayisə, ümumiləşdirmə, mücərrədləşdirmə kimi idrak bacarıqlarının inkişaf səviyyəsi ilə ölçülür. Kreativliyin yaranması üçün əsas zəmin ümumi təhsilin məzmununda yaradılır.

"Görəsən, şagirdlərdə yaradıcı təfəkkür formalaşdırmaq lazımdırmı? Şübhəsiz ki, lazımdır. Və elmi-texniki inqilab şəraitində bu, məktəbin əsas vəzifələrindən biri olmalıdır" (2). Məktəb özünün yaradıcı təfəkkürə malik olan nəsil formalaşdırmaq missiyasını haradan başlamalıdır? Təhsil məkanında şagirdin kreativ bacarıqlarının bünövrəsi daha çox hansı komponentin üzərinə düşür?

Təbii ki, bu suallar ətrafında düşünərkən, ilk növbədə kreativliyi yaradan məzmun üzərində dayanmaq daha çox məntiqəuyğun hesab edilir. Ümumi təhsilin məzmunu bu baxımdan daha çox münbit olmaqla yaradıcı təfəkkürə, kreativliyə şərait yaratmalıdır. Müşahidələr, əldə olunan təcrübələr də onu göstərir ki, təlim materiallarının sadəcə təsvirini vermək, onları şablon kimi şagirdlərin yaddaşına təqdim etmək heç də şagirdlərin yaradıcı təfəkkürünə imkan yarada bilmir. Əksinə, onların düşünmək səlahiyyətlərini əlindən alır, fəallıq və çeviklik imkanlarını məhdudlaşdırır. Odur ki, əvvəlcədən şagird düşüncəsinin səviyyəsini ifadə edən nəticələrin müəyyən olunması və öyrənmə fəaliyyətinin ona yönəldilməsi müasir təhsil yanaşmalarında aktual və didaktik cəhətdən əhəmiyyətli hesab edilir.

Beləliklə, ümumi təhsilin məzmun komponentində kreativliyin və çevikliyin inkişaf etdirilməsinə imkan yaratmaq, onun ardıcıl olaraq davam etdirilməsinə təminat vermək xüsusi prinsipial tələb kimi vacib hesab edilir.

*Rəyçi: dos. Ə.Abbasov*

**İstifadə olunmuş ədəbiyyat**


1. "Təhsil haqqında" Azərbaycan Respublikasının Qanunu. Azərbaycan məktəbi, 2009, № 6.
2. Əlizadə Ə. Yeni pedaqoji təfəkkür: ideyalar, prinsiplər, problemlər. Psixopedaqoji araşdırmalar. B.: Adiloğlu, 2011.
3. Сластенин В., Исаев И., Мищенка А. и др. Педагогика. М.: Школа-Пресс, 1997.
4. Kərimova F., Əhmədova M., Varella G., Reyli Ə. İnteqrativ kurikulum: mahiyyəti və nümunələr. Bakı: Adiloğlu, 2005.
5. Balayeva G. İbtidai təhsilin məzmununun nəzəri-pedaqoji problemləri. Bakı: Elm və təhsil, 2002.


**М.Мамедова**

**Определение содержания общего образования: важные дидактические принципы**

**Резюме**

В статье говорится об определении содержания общего образования. Отмечается что, велика роль интеграции в повышении качества образования.

**M. Mammadova**

**Determination of the content of general education: important didactic principles**

**Summary**

In the article it is spoken about the determination of the content of education. It is noted that integration plays an important role in improving the quality of education.

# İXTİSASARTIRMA TƏHSİLİ MÜHÜM AMİL KİMİ



**Rahim Əzizov,**
***Azərbaycan Müəllimlər İnstitutunun əlavə təhsil üzrə prorektoru, pedaqogika üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *ixtisasartırma təhsili, innovasiya, yeni təlim metodları, müasir texnologiyalar.*

***Ключевые слова:*** *образование по повышению квалификации, инновация, новые методы обучения, современные технологии.*

***Key words:*** *professional education, innovation, new teaching methods, modern technologies.*

Gələcəyə gedən yolun düzgün seçilməsində malik olduğun dəyərlərin, toplanmış təcrübənin, kadr potensialının peşəkarlıq səviyyəsinin, idarəetmə subyektlərinin əlaqə formalarının, maliyyə imkanlarının, eləcə də mütərəqqi dünya təcrübəsinin hərtərəfli öyrənilməsinin böyük əhəmiyyəti vardır. Azərbaycan təhsilinin mövcud vəziyyətinin istər milli, istərsə də beynəlxalq qurumlar tərəfindən qiymətləndirilməsinə dair hesabatların hamısında birmənalı şəkildə vurğulanır: Təhsilin inkişafı istiqamətində mühüm nailiyyətlər əldə edilmiş, həyata keçirilən dövlət proqramları çərçivəsində ölkənin bütün regionlarında ümumi təhsilin infrastrukturu əhəmiyyətli şəkildə yeniləşdirilmiş, təhsilin müasir tələblərə cavab verən hüquqi-normativ bazası yaradılmışdır.

Respublikamızda tədris prosesinin təkmilləşdirilməsi üçün yeni, daha mükəmməl metodların tətbiq edilməsi yüksək intellektual hazırlığa, hərtərəfli dünyagörüşə malik olan, qazandığı biliklərdən istifadə etməyi bacaran, milli-mənəvi və ümumbəşəri keyfiyyətlərə yiyələnmiş kamil şəxsiyyətin, əsl vətəndaşın yetişdirilməsinə xidmət edir. “Azərbaycan Respublikasında Təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nda deyilir: “Müəllim amili təhsilalanın öyrənməsi və inkişafı, nailiyyətlərin monitorinqi prosesində həlledici rol oynayır”. Təhsilin keyfiyyətini yüksəltmək və onun dinamik inkişafını təmin etmək üçün yeni pedaqoji texnologiyalardan, yeni təlim metodlarından istifadəyə üstünlük verilir. Təlimdə tətbiq edilən metodlar şagirdlərə proqram dairəsində biliklərin verilməsi ilə bərabər, həm də onların hərtərəfli inkişaf etmiş şəxsiyyət kimi formalaşmasına istiqamətləndirilir. Burada təhsilverənlərin üzərinə çox böyük vəzifələr düşür. Çünki məktəb təcrübəsində yeni təlim metodlarının tətbiqində uğurlarla yanaşı, nöqsanların da olmasında təlim metodlarının təsadüfi seçilməsi və ya yanlış tətbiqinin, dərsdə reproduktiv (məlumatverici) metodlara üstünlük verilməsinin rolu az deyildir. Burada təhsilalanların yaradıcılıq qabiliyyətlərini inkişaf etdirə biləcək metodların



* 3

düzgün tətbiq edilməməsinin, müasir təlim üsullarından istifadə edərkən dərsin didaktik məqsədinin və fənnin xüsusiyyətlərinin nəzərə alınmamasının da böyük təsiri vardır. Deməli, müəllimlərin bir çoxu hələ də ya yeni təlim metodlarının tətbiqinə yaradıcı yanaşmır, ya bu sahədə nəzəri bilikləri qənaətbəxş deyil, ya da onların mahiyyətini olduğu kimi dərk edə bilməmişdir.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin imza atdığı iki mühüm sənəd: "Azərbaycan 2020: Gələcəyə baxış" və "Azərbaycan Respublikasında Təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda pedaqoji sahədə çalışan bütün işçilərin qarşısında çox mühüm vəzifələr qoyulmuşdur.

"Azərbaycan Respublikasında Təhsilin İnkişafı üzrə Dövlət Strategiyasında" keyfiyyət nəticələri və əhəmiyyətinə görə dünya ölkələri sırasında aparıcı mövqe tutan, səriştəli müəllim və təhsil menecerlərinə, qabaqcıl texnologiyalara əsaslanan infrastruktura malik təhsil sisteminin yaradılması üçün beş strateji istiqamətdə genişmiqyaslı tədbirlər nəzərdə tutulmuşdur. Həmin istiqamətlərdən ikincisi "təhsil sahəsində insan resurslarının müasirləşdirilməsi"ni nəzərdə tutur. Bu istiqamət innovativ təlim metodlarını tətbiq edən, təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən səriştəli təhsilverənin formalaşmasına xidmət edir və özündə təhsilverənlərin peşəkarlığının yüksəldilməsi, təhsilalanların nailiyyətlərinin qiymətləndirilməsi üzrə yeni sistemlərin qurulması, təhsilalanların istedadının aşkar olunması inkişafı ilə bağlı, habelə xüsusi qayğıya ehtiyacı olanlar üçün inklüziv təlim metodologiyasının yaradılmasını ehtiva edir.

Azərbaycan Respublikasının Təhsil Nazirliyində yuxarıda qeyd edilən məsələlərlə bağlı bir sıra təxirəsalınmaz işlər aparılır ki, bu da əlavə təhsillə məşğul olan təhsil müəssisələrinin məsuliyyətini artırır. Cari dərs ilinin yekununda Bakı şəhərində çalışan müəllimlərin sınaq qiymətləndirilməsi məsələləri, mən deyərdim ki, pedaqoji kollektivlərdə bir canlanma mühiti yaratdı. Belə ki, bu qiymətləndirmənin nəticəsi olaraq təlimlərdə uğur qazanmayan müəllimlərə əlavə təhsil müəssisələrində müasir təlim texnologiyaları, müəllimlərin peşəkarlıq səviyyəsinin artırılması və digər məsələləri ixtisasartırma təhsili yolu ilə öyrənmələri tövsiyə olunur. Ona görə də əlavə təhsillə məşğul olan təhsil müəssisələri müəllimlərin ehtiyacını nəzərə alaraq daha müasir tədris-tematik planlar hazırlamalıdırlar.

Azərbaycan Müəllimlər İnstitutu ölkədə ən iri əlavə təhsil müəssisəsidir. Ulu öndər Heydər Əliyevin sərəncamı ilə yaradılmış bu təhsil müəssisəsi həm ilkin müəllim hazırlığı, həm də müəllimlərin ixtisasartırma, yenidənhazırlanma və pedaqoji kadrların təkmilləşdirilməsi ilə məşğuldur. Təhsil sahəsində hal-hazırda 200 minə qədər müəllim çalışır. Mövcud hüquqi-normativ sənədlərə əsaslanaraq müvafiq təlimata görə "5 ildə bir dəfə" prinsipini izləsək, vəziyyətin nə qədər aktual olduğunu görərik.

Azərbaycan Müəllimlər İnstitutunda pedaqoji kadrların ixtisasartırma təhsilinin təşkili məsələləri diqqət mərkəzində saxlanılır və təşkil ediləcək təlimlərin müəllimlərin tələbatının ödənilməsi prinsipinə uyğun aparılması üçün tədbirlər müəyyənləşdirilir. Hal-hazırda ixtisasartırma təhsilini təşkil etmək üçün 60-dan artıq tədris-tematik plan hazırlanıb. Planlaşdırmaya əsasən 3 aylıq, 2 aylıq, 24 günlük, 12 günlük tədris-tematik planlar yenilənib, müasirləşdirilib və "tələb-təklif-sifariş" prinsipi gözlənilməklə təsdiq olunub. Eyni zamanda, "Kaskad", "Kurikulumların tətbiqi", "Fəal və interaktiv təlim", "Təlimçi hazırlığı", "Həyati bacarıqlara əsaslanan təhsil", "Təhsildə innovasiyalar", "İKT-nin tədrisə tətbiqi" və s. mövzularda dövri seminar-

lar, treninqlər və məşğələlər keçirilir. Adı çəkilən təlimlərə son vaxtlar müraciət edənlər daha çoxdur. Bu ondan irəli gəlir ki, müəllimlərin qiymətləndirilməsi məsələsi reallığa çevriləndən sonra müraciətlər artıb.

İxtisasartırma təhsili bir tədris ili üçün planlaşdırılır. Belə ki, mövcud qaydalara əsasən bütün təhsil müəssisələri ilə müqavilələr imzalanıb, qrafiklər təsdiq olunub. 2013/2014-cü dərs ilində respublikamızda fəaliyyət göstərən 66 rayon (şəhər) təhsil şöbəsindən 53-ü, 60 orta ixtisas təhsili müəssisəsindən 17-si, 108 ilk-peşə ixtisas təhsili müəssisəsindən 19-u, 17 respublika tabeliyində olan ümumtəhsil müəssisəsindən 2-si və 21 ali təhsil müəssisəsi ilə müqavilə imzalanmışdır. Təəssüf hissi ilə qeyd etməliyik ki, hələ də ixtisasartırma təhsilini 30 il bundan qabaqkı təhsil hesab edənlər vardır. Daha da təəccüblüsü budur ki, onun əhəmiyyətini dərk edə bilməyən rəhbər pedaqoji işçilər də mövcuddur. Azərbaycan Respublikası Nazirlər Kabinetinin 6 sentyabr 2010-cu il tarixli 163 nömrəli qərarı ilə “ Əlavə təhsilin məzmunu, təşkili və onun hər hansı bir istiqaməti üzrə təhsil almış şəxslərə müvafiq sənədin verilməsi qaydaları” təsdiq edilmişdir. Bu qərara əsasən respublikamızda əlavə təhsilin bir istiqaməti olan ixtisasartırma təhsilinin tamamilə yeniləşdirilərək, dövrün tələbatına uyğunlaşdırılması aktuallaşıb. Yaxın gələcəkdə ixtisasartırma təhsilinin kredit-modul sisteminə keçməsi gözlənilir. Yəni ənənəvi ixtisasartırma təhsili artıq öz əhəmiyyətini itirir. Daha çevik, daha müasir və stimullaşdırıcı amillərə əsaslanan ixtisasartırma təhsilinə ehtiyac artır.

Tədris prosesində institutun professor, müəllim, metodik korpusu ilə yanaşı, AMEA-nın, Təhsil Nazirliyinin, Bakı Dövlət Universitetinin, Bakı Slavyan Universitetinin, Təhsil Problemləri İnstitutunun professor-müəllim heyəti, Milli Məclis üzvləri, qabaqcıl təhsil işçiləri, təhsil və elm xadimləri, dərslik müəllifləri təlimə cəlb olunurlar. Bir sıra qeyri-hökumət təşkilatları və dövlət təşkilatları,“Müəllim-Valideyn Assosasiyası”, “Dünyaya baxış”, Bərpa və İnkişaf Mərkəzi, İnklüziv təlim mərkəzi, Daxili İşlər Nazirliyinin İnsan Alverinə Qarşı Mübarizə İdarəsi və digər təşkilatlar dinləyicilər qarşısında maraqlı söhbətlər aparırlar.

Nəzəri təhsillə yanaşı, Təhsil Nazirliyinin təhkimedilmə haqqında əmri əsasında respublikanın ali məktəblərinin, AMEA-nın sahə institutlarının, Bakı və Sumqayıt şəhərlərinin tədris müəssisələrindən təcrübəkeçmə üçün baza müəssisəsi kimi istifadə olunur.

2013/2014-cü dərs ilində Azərbaycan Müəllimlər İnstitutu və onun filiallarında 11 minə yaxın pedaqoji işçi müxtəlif kateqoriyalar üzrə təlimdən keçiblər. Bu kontingentin 3160 nəfəri Azərbaycan Müəllimlər İnstitutunun payına düşür. Həmin kontingentə daxil olan dinləyicilərdən 242 nəfər “Öyrədənlərin öyrədəni”, 315 nəfər “kurikulumların tətbiqi” proqramlarını öyrənən dinləyicilər olmuşlar. Aparılan tədqiqatlar göstərir ki, ixtisasartırma təhsilinə gələn dinləyicilərin əksəriyyəti yeni təlim texnologiyaları, İKT bacarıqları, fəal və interaktiv təlim-təhsildə baş verən yenilikləri öyrənmək həvəsindədirlər.

Artıq ibtidai sinif müəllimlərinin 10 günlük təlimlərə cəlb olunduğu dövrdən 5 il keçir. Keçən müddət ərzində hansı nailiyyətlər qazanılıb, hansı problemlər yaranıb, müəllimlərin peşəkarlıq keyfiyyətini öyrənmək, qiymətləndirmək və stimullaşdırmaq üçün mexanizmlər hazırdırmı? Bu proseslərdə əlavə təhsil müəssisələrinin vəzifə və səlahiyyətləri dəyişiləcəkmi? Məlumdur ki, bu gün müxtəlifmüddətli ixtisasartırma təhsilinə cəlb edilən pedaqoji kadrlara verilmiş sertifikatlar stimullaşdırıcı xarakter daşımır.

Sirr deyil ki, bu cəhət ixtisasartırma təhsilinə marağı azaldır. Bir halda ki, əməyin stimullaşdırılmasında diferensiallaşdırma əsas vəzifəyə çevrilir, o zaman pedaqoji kadrlara cəlb olunduqları ixtisasartırma təhsilinin yekununda onların əməyinin stimullaşdırılmasına səbəb olacaq sənəd verilməlidir. Təbii ki, əldə etdikləri bacarıqlara görə. Yəni təlimə cəlb olunub yekununda hamıya sertifikat verilməsi vaxtı artıq çoxdan başa çatıb. Bir sözlə, bacarıqlar, qabiliyyətlər, fəaliyyət amilləri müəyyənləşdirilməli, keyfiyyətli təlimlər keçib real nəticələr əldə edilməlidir.

Azərbaycan müəllimlərinin XIV qurultayındakı məruzəsində Respublikanın təhsil naziri M.Cabbarov xüsusi olaraq vurğulamışdır ki, strategiyanın reallaşması təhsilin məzmununun mənimsənilməsini təmin edən səriştəli təhsilverənlərin formalaşmasına, təhsildə nəticələrə görə cavabdeh, şəffaf, səmərəli tənzimləmə və idarəetmə mexanizmlərinin, müasir tələblərə uyğun və ömürboyu təhsili təmin edən təhsil infrastrukturunun yaradılmasına zəmin yaradacaqdır. İndi həm təhsilverənlər, həm də təhsilalanlar elə bir keyfiyyətə malik olmalıdırlar ki, cəmiyyətin tələbatını ödəməyə nail olsunlar.

Yeni dərs ilində məktəbəqədər təhsil müəssisələrində çalışan rəhbər və digər kateqoriyalardan olan pedaqoji işçilərin təlimə cəlb edilməsi məqsədi ilə hüquqi-normativ sənədlər hazırlanmışdır. Bir faktı qeyd etmək istəyirəm ki, ölkəmizin ümumtəhsil məktəblərinin birinci sinfində oxuyan şagirdlərin yalnız 22-24 faizi məktəbəqədər təhsil müəssisələrindən gəlir. Bu da həmin uşaqların təlimdə geriləməsinə və dərsləri mənimsəməsində xeyli çətinliklər yaradır. Ötən tədris ilində Bakı Şəhər İcra Hakimiyyətinin İnstituta ünvanladığı məktubuna əsasən Bakı şəhəri üzrə məktəbəqədər təhsil müəssisələrinin 200 nəfərdən çox işçisi 24 günlük ixtisasartırma təhsilindən keçmişlər. 2014/2015-ci dərs ilində də bütün kateqoriyadan olan pedaqoji işçilərin ixtisasartırma təhsili dövrün tələblərinə uyğunlaşdırılıb.

*Rəyçi: prof. R.Hüseynzadə*

**Р.Азизов**

**Образование по повышению квалификации как важный фактор**

**Резюме**

В статье говорится о роли образования по повышению квалификации уровня профессионализма учителей, а также отмечается важность подготовки нормативно-правовых документов, для привлечения к обучению педагогических кадров, работающих в дошкольных учреждениях.

**R.Azizov**

**Training is an important factor**

**Summary**

The article is dedicated to the role of training pedagogical stuff to improve their professionalism. It is noted that legal and regulative documents must be prepared to involve preschool teachers working in educational institutions to training.

# ДИСТАНЦИОННОЕ ОБРАЗОВАНИЕ – БУДУЩЕЕ СОВРЕМЕННО ШКОЛЫ



***Рагим Гусейнов,***
***Кандидат педагогических наук, доцент***
***Директор 193 полной средней школы г.Баку***

***Açar sözlər:*** *distant təhsil, təhsil texnologiyaları, interaktiv təlim, kommunikativ təhsil texnologiyaları.*

***Ключевые слова:*** *дистанционное образование, образовательные технологии, интерактивное обучение, технологии в образовании.*

***Key words:*** *distant education, educational technologies, interactive training, communication technologies.*

Международная комиссия ЮНЕСКО определяет два основных принципа современного образования: “образование для всех” и “обучение в течение всей жизни”. И для реализации обоих этих принципов наиболее востребованным на сегодняшний день стало дистанционное обучение.

Дистанционное образование - это термин, которые используют применительно к широкому спектру образовательных программ и представляет собой высокотехнологичный продукт научно-технической революции, широко использующий идею маркетингового подхода к обслуживанию студентов, чем и объясняется его активное распространение во всем мире. Начиная от курсов повышения квалификации, не имеющих аккредитации, заканчивая аккредитованными программами высшего образования. Дистанционное образование реализует возможность тесного общения студентов со своими преподавателями и сокурсниками, как это происходит на очном обучении. Сегодня дистанционное обучение органично впитывает в себя компьютерные и интернет-технологии обучения. Для того, чтобы обеспечить эффективное взаимодействие, при дистанционном обучении используется целый набор инструментов, включая интерактивные компьютерные программы, интернет, электронную почту, телефон, факс и обычную почту. Эти современные технологии являются связующим звеном между студентом и преподавателем, которых могут разделять тысячи километров.

Дистанционное образование становиться чрезвычайно популярной формой обучения в силу своего удобства и гибкости. Притом, необходимо отметить,что оно охватывает как обучение студентов, так и переподготовку или получия второй специальности специалистами в той или иной области. Оно устраняет основной барьер, удерживающий многих профессионалов и деловых людей от продолжения образования, а именно, избавляет от необходимости посещать занятия по установленному расписанию. Обучающиеся дистанционно, могут выбирать удобное для себя время занятий согласно собственному расписанию.




Buradakı əşyaların ümumi cəhətləri odur ki, hərəsinin ayrı leksik mənası var. Uşaqlar sual işarəsinin üzərinə tıklamaqla ( klik) sualın cavabının düzgünlüyünü yoxlayırlar.

Tədqiqatın aparılması

M:- Uşaqlar, tədqiqat sualımıza cavab vermək üçün gəlin qruplarda işləyək.

Tədqiqatın aprılması məqsədi ilə şagirdlər qruplara bölünür və hər qrupa aşağıdakı iş vərəqləri təqdim olunur. (Qrupların adları omonim və ya çoxmənalı sözlərlə adlandırılıb).

YAY qrupu:

Suallara düzgün cavab versəniz Tıq–Tıq xanım sizinlə dost olacaq. Əgər qrup üzvləri tapşırıqları düzgün yerinə yetirsələr bu zaman dərsin motivasiya hissəsindəki oğlan şəkli Tık –Tık xanımın yanında görünəcək.

1. Şeir parçasında omonimləri tapın.

Bir səs gəlir ürəyimdən- Rza, yaz !
Qarşı gündən gülümsəyən yaza yaz!

2. Qrupunuzun adı "yay" sözü necə sözdür?

A) Omonimdir
B) Çoxmənalı sözdür
C) Həm omonim, həm də çoxmənalı sözdür

GÖZ qrupu

Suallara düzgün cavab verin və Tıq-Tıq xanıma Siçan bəyi tapmağa kömək edin. Əgər qrup üzvləri tapşırıqları düzgün yerinə yetirsələr bu zaman Siçan bəyin şəkli Tık-Tık xanımın yanında görünəcək.

1. Şeir parçasında omonimləri tapıb hansı nitq hissəsinə aid olduğunu söyləyin.

2. Verilmiş sözlərdən hansı ağac, söz və insan sözlərinin yanında işlənə bilər?

A) Kök B) Yay C) qaş

TUT qrupu

Suallara düzgün cavab verin ki, Tık-Tık xanım konfetləri səbətə toplasın . (Əgər












qrup üzvləri tapşırıqları düzgün yerinə yetirsələr bu zaman onun səbətində konfetlər görünəcək)

1.Verilmiş sözlər içərisində neçə omonim söz var? kitab, tut, gəlin, şam, gül

A)bir B) iki C) üç

2. Bədii nümunədə omonim sözləri tapın.

Keçək Kür çayını, Araz çayını,
İçək Lənkəranın dadlı çayını.

A) Araz B) içək C) çay

XAL qrupu

Suallara düzgün cavab verin ki, Tık-Tık xanım gölməçədən xilas olsun (Əgər






qrup üzvləri tapşırıqları düzgün yerinə yetirsələr bu zaman Tık – Tık xanım gölməçədən kənara çıxacaq)

1. Bayatıda işlənən hansı söz omonimdir?

Əzizim kətan sarı,
Ağ sarı, kətan sarı.
Çıxaydım Şah dağına,
Baxaydım vətən sarı.

A)sarı B) kətan C) ağ

2. Omonim və çoxmənalı sözlərin oxşar və fərqli cəhətləri hansılardır?

A) Müxtəlif cür yazılır
B) Əksmənalı olur
C) Eyni cür yazılır

İnformasiya mübadiləsi:

Məlumatın müzakirəsi və təşkili zamanı qrupların təqdimatı dinlənilir və bu zaman digər qrupların əlavələrinə də şərait yaradılır. Müzakirə və təqdimat zamanı müəllim aşağıdakı suallarla qrup üzvlərinə müraciət edir.

- Bu sözlərin oxşar və fərqli cəhətləri nədədir?

- Nəyə görə yazdığınız kimi tələffüz etdiyiniz sözlər bir-birindən fərqləndi?

- Elə sözlər var ki, bir səs ilə bir –birindən fərqlənir (atlaz, atlas, sənət, sənəd) belə sözlərə omonim deyə bilərikmi?( paronim)

Qrup üzvlərinin qiymətləndirilməsi cədvəli:

Yaradıcı Tətbiqetmə



QİYMƏTLƏNDİRMƏ

| QRUPLAR / MEYARLAR | I qrup | II qrup | III qrup | IV qrup | | |
|---|---|---|---|---|---|---|
| Omonim sözləri müəyyənləşdirirlər | | | | | | |
| Tapşırığı düzgün yerinə yetirirlər | | | | | | |
| Digər qrupların tapşırıqlarına əlavələr edirlər | | | | | | |
| Düzgün təqdimat edirlər | | | | | | |
| YEKUN | | | | | | |

* 5







Yuxarıdakı şəkildə solda sandıqdan çıxarılan sözlər qruplaşdırılıb lazım olan yerdə cəmləndirilir.

Suallara düzgün cavab verdikdə göy qurşağını rəngləməkdə Tık-Tık xanıma yardım edilir.

Şəkillərdə nöqtələrin yerinə müvafiq sözləri qoyulur və mənası izah edilir.

Sonda ev tapşırığı. Venn diaqramına özünüzdən müvafiq sözlər yazın.

Dərslərin belə qruplaşması göstərir ki, ibtidai siniflərdə fənlər üzrə yeni təhsil proqramlarının kurikulumların) tətbiqi şagirdlərin ümumi inkişafını təmin etməklə onların təfəkkürünün formalaşması imkanlarını genişləndirir. Həm də o cəhət maraqlıdır ki, bu proses onları bir sıra çətinliklərlə qarşılaşdırır. Bunlar isə onunla nəticələnir ki, şagirdlərin şifahi nitqi inkişaf edir. Onlarda nitq mədəniyyətinin formalaşmasının əsası qoyulur.

*Rəyçi: təhsil eksperti Z.Veysova*

**Р.Агаева**

**Урок подготовленый на основе программы Активинспире**

**Резюме**

В статье по предмету "Азербайджанский язык" в 4 классе был предъявлен обширный план по теме "Отличие омонимов от многозначных слов", а также была представлена презентация с использованием компьютерных технологий. Обратили внимание на нижеперечисленные пункты:

*Обогащение словарного запаса учеников.

*Объяснение значения омонимов.

*Выявление сходства и различия многозначных слов.

*Выявление сходства и различия омонимов от многозначных слов.

**R.Agayeva**

**Lesson programme based on Aktivinspire**

**Summary**

The article is dedicated to the differences between homonyms and poly semantic words and presentations using computer technologies.

Following issues are paid attention:

-to enrich students’ vocabulary;

-to explain the meanings of homonyms;

-to define the differences and similarities of poly semantic words;

-to define the similarities and differences between homonyms and poly semantic words.

# TƏDRİS PROSESİNDƏ İNTEQRASİYAYA DAİR

**Firuzə Kərimova,**
***Azərbaycan Respublikası Təhsil Problemləri İnstitutunun böyük elmi işçisi***

***Açar sözlər:*** *inteqrasiya, fəndaxili, fənlərarası, metakoqnitiv bacarıqlar, nəzəri biliklər, elmi biliklər.*

***Ключевые слова:*** *интеграция, теоретические, внутрипредметная, метакогнитивные умения, межпредметная, научные знания.*

***Key words:*** *integration, intrasubject, intersubject, metacognitive skill, theoretical, scientific view.*

Bütün fənlərin tədrisində olduğu kimi, riyaziyyatın tədrisində də inteqrasiyadan istifadə etmədən istənilən nəticəni əldə etmək mümkün deyil. Aydındır ki, nəzərdə tutulan məzmunun ətraflı mənimsədilməsində, qazanılan nəzəri biliklərin praktik olaraq həyata tətbiq edilməsində və şagirdlərin elmi dünyagörüşünün formalaşmasında inteqrasiyanın rolu inkarolunmazdır.

İnteqrasiya dedikdə, təlim prosesində şagirdlərin təfəkküründə ətraf aləmin tam və vahid obrazını formalaşdırmaq üçün təlimin məzmun komponentlərinin struktur əlaqələr əsasında sistemləşdirilməsi başa düşülür.

Fənlər üçün təhsil proqramlarında inteqrasiya əsas tələblərdən biri kimi nəzərə alınmışdır. Riyaziyyat üzrə təhsil proqramında da məzmun, strategiya və qiymətləndirməyə aid hissələr arasında bağlılığın yaradılması, onların bütöv bir konseptual sənəd kimi formalaşdırılmasına kifayət qədər yer verilmişdir. Sənəddə bütün hissələrin arasında inteqrativliyin gözlənilməsinə xüsusi diqqət yetirilmişdir.

Təhsil sahəsində inteqrasiyanın bir neçə növü tətbiq edilir: Fəndaxili inteqrasiya hər bir fənn üzrə anlayış, bilik və bacarıqların əlaqələndirilməsini nəzərdə tutur. Bu növ inteqrasiya tədris materialını ayrı-ayrı tədris vahidlərində cəmləşdirməklə, fənnin məzmun strukturunu müəyyən edir.

Ənənəvi proqramda ümumtəhsil məktəblərində riyaziyyat, cəbr və həndəsə arasında olan əlaqədən səmərəli istifadə olunurdu. İbtidai siniflərin riyaziyyat proqramında isə şagirdlər cəbr (tənlik) və həndəsənin (fiqurlar) ilkin anlayışları ilə tanış olurdular. Sonrakı siniflərdə isə onların bu haqda bilikləri sadədən mürəkkəbə doğru dəyişirdi. Riyaziyyat fənni üzrə indiki təhsil proqramında (kurikulumda) 5 məzmun xətti müəyyən edilmişdir: ədədlər və əməllər, cəbr və funksiyalar, həndəsə, ölçmə, statistika və ehtimal. Məzmun xətləri bir-biri ilə inteqrativ şəkildə tədris olunur. Artıq həndəsə ayrıca fənn kimi tədris olunmur. Statistika və ehtimal təhsil proqramında (kurikulumda) beşinci məzmun xətti olub, digər məzmun xətləri kimi bütün siniflər üzrə dəyişməz qalır, onlara aid məzmun isə sadədən mürəkkəbə doğru daim dəyişir, dərinləşir və genişləndirilir. Lakin ənənəvi proqramda ehtimal haqqında biliklər yalnız XI sinifdə verilirdi.

Fənlərarası inteqrasiya bir neçə fənnin əhatə etdiyi ortaq anlayış, bilik və bacarıqların sintezi olmaqla, bir fənnə aid anlayışların və metodların digər bir fənnin öyrənilməsində istifadəsini nəzərdə tutur. Bu zaman müxtəlif fənlərə aid, lakin bir-birini tamamlayan, o cümlədən oxşar olan stan-

dartların inteqrasiya imkanları müəyyən edilir. Odur ki, müxtəlif fənlərin standartları arasındakı inteqrasiyanın müəyyənləşdirilməsi, fənlərarası bacarıqların formalaşdırılmasında bundan yaradıcılıqla istifadə olunması mühüm əhəmiyyət kəsb edir.

Təhsil proqramında (kurikulumda) inteqrasiya cədvəl formasında verilməklə fənlər üzrə uyğun gələn nəticələrin əlaqəliliyini ifadə edir. Fənlər üzrə nəticələr kodlar şəklində cədvəldə göstərilir.

Perspektiv planlaşdırma nümunəsində inteqrasiya xüsusi olaraq nəzərə alınır. Müəllim özünün gündəlik dərs planına da inteqrasiyanı daxil edir. İnteqrasiya təlim prosesində istifadə edilən təlim tapşırıqlarında öz əksini tapır.

Riyaziyyat ilə fizika bir-birinin inkişafına qarşılıqlı təsir göstərir. Məktəbdə riyaziyyat dərsləri fizika təlimi üçün baza hazırlayır. Eyni zamanda, fizikaya aid materiallar riyaziyyat dərslərində nəzəri biliklərin tətbiqi üçün geniş imkan yaradır. Məsələn: fizikadan VI sinfin "1.1.2. Müxtəlif xarakterli fiziki hadisələrə dair sadə məsələləri həll edir" standartı riyaziyyatın VI sinfindəki "1.2.1. Tam ədədlər üzərində hesab əməllərini yerinə yetirir" standartı ilə inteqrasiya olunur. Təlim prosesində fiziki hadisələrə dair sadə məsələlər hesab əməlləri vasitəsi ilə yerinə yetirilir ki, bu da təlim tapşırıqlarında öz əksini tapır.

Kimyadan bilik və bacarıqları əldə etmək üçün riyazi biliyə, hesablama bacarığına sahib olmaq lazımdır. O biri tərəfdən, məzmunu kimyadan olan riyazi məsələlər təbiət hadisələrini dərk etməkdə şagirdlərə kömək edən ən gözəl vasitədir. Məsələn: kimyadan VIII sinfin "1.3.1. Atomun quruluşuna, kimyəvi rabitələrə, elektrolit məhlulunda baş verən proseslərə aid məsələlər qurur və həll edir" standartı riyaziyyatın VIII sinfindəki "2.2.1. Rasional ifadələr üzərində əməlləri yerinə yetirir" standartı ilə inteqrasiya olunur.

Coğrafiya dərslərində plandan və xəritədən istifadə etmək, miqyas, en və uzunluq dairələri, bir yerin coğrafiya koordinatları anlayışı və statistik məlumatlar bilavasitə riyaziyyatla bağlıdır. Məsələn: coğrafiyadan VI sinfin "1.3.2. Yaşadığı ərazinin planını tərtib edir" standartı riyaziyyatın VI sinfindəki "1.2.5. Nisbət, tənasüb, düz mütənasib, tərs mütənasib kəmiyyətlərə və faizə aid sadə məsələləri həll edir" standartı ilə inteqrasiya olunur.

Məsələn: "Miqyas" mövzusunda inteqrasiya təlim tapşırıqlarında ifadə olunur. "Həqiqi ölçüsü 600km olan məsafə xəritədə 3sm-ə uyğun olarsa, miqyası təyin edin" tapşırığını nümunə üçün göstərmək olar.

Deməli, riyaziyyat bir sıra fənlərlə əlaqəli və onlarla interaktiv şəkildə tədris olunanda daha effektli nəticələrə nail olmaq mümkün olur. Eyni zamanda, digər fənlər də riyazi məsələlər vasitəsilə riyaziyyatın tədrisində iştirak edir. Riyaziyyatın belə inteqrativ tədrisi, dərsin səmərəli qurulmasına, şagirdlərin fəallığının və marağının artmasına şərait yaradır. Bütün bunlar isə müasir tədris metodikasında əhəmiyyətli yer tutan amillərdən biridir.

Yuxarıda deyilənlərin həyata keçirilməsində, yəni təlimin səmərəli keçirilməsində müəllimin hazırlığı başlıca yer tutur. O, ardıcıl olaraq didaktik prinsipləri (şüurluluq, elmilik, sistematiklik, formal əyanilik, fərdi yanaşma və s.) daima diqqət mərkəzində saxlamalıdır.

Aydındır ki, fəal təlim prosesində müəllim dərsdə əlverişli psixoloji mühit, emosional vəziyyət yaratmalıdır. Yalnız belə prosesdə fənlərarası əlaqələr öz müsbət nəticəsini verə bilər. Bu çox vacib məsələdir. Çünki indi təlim-tədris prosesində qarşıya yeni baxış, yeni müasir yanaşma tələbləri qoyulmuşdur.

*Rəyçi: dos. A.Bəkirova*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası.// Azərbaycan məktəbi, 2013, № 5.
2. Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu). Bakı, 2006.
3. Veysova Z. Fəal (interaktiv) təlim: müəllimlər üçün vəsait. Bakı, 2007.
4. Riyaziyyat fənni üzrə təhsil proqramı (kurikulumu). 2010.
5. Əhmədov A., Abbasov Ə. Yeni təhsil proqramlarının (kurikulumların) tətbiqi məsələləri: Ümumi təhsildə inteqrasiya. Bakı: Mütərcim, 2014.

**Ф.Каримова**

**Об интеграции в процессе обучения**

**Резюме**

Интеграция играет большую роль в усвоении содержания образования, практическом применении теоретических знаний и формировании мировоззрений учащихся.

В статье раскрывается сущность интеграции. Интерактивное обучение служит для продуктивности уроков и активности учеников в учебном процессе.

**F.Karimova**

**About the integration in teaching process**

**Summary**

The role of integration is referred in comprehending the content of the topic, practicing students’ theoretical knowledge, developing their scientific view of the subject. The help of applying integration develop students’ metacognitive skills to solve problems in real life. The types of integration: intersubject and intrasubject integration have been mentioned in this article and shown how to develop classroom activities effectively.

* * *

# TEXNOLOGİYA FƏNNİ ÜZRƏ ŞAGİRD NAİLİYYƏTLƏRİNİN QİYMƏTLƏNDİRİLMƏSİ

**Xuraman Səlimova,**
***Azərbaycan Respublikası Təhsil Problemləri İnstitutunun Monitorinq və qiymətləndirmə şöbəsinin böyük elmi işçisi***

***Açar sözlər:*** *qiymətləndirmə standartı, kurikulum, rubriklər, meyarlar, təlim nailiyyəti.*

***Ключевые слова:*** *стандарты оценивания, курикулум, рубрики, критерии, учебные достижения.*

***Key words:*** *assesment standards, curiculum, rubrics, criteria, teachinq achievement.*

Müasir dövrdə qiymətləndirmə təhsilin keyfiyyətinin idarə olunması, inkişaf dinamikasının izlənilməsi və proqnozlaşdırılması üçün real vəziyyətin öyrənilməsinə kömək edən mühüm pedaqoji vasitədir. Qiymətləndirmə təlim-tərbiyə prosesini təkmilləşdirməyə, təlim prosesinin səmərəliliyini yüksəltməyə, təhsilalanların nəyi mənimsədiklərini, nələri öyrəndiklərini, nələr əldə edə bildiklərini və hansı keyfiyyət dəyişikliklərinin formalaşdığını müəyyənləşdirməyə obyektiv şərait yaradır.

Qiymətləndirmə təsdiqləyici və yoxlayıcı xarakter daşımaqla bərabər, həm də formalaşdırıcı, təyinedici və hazırlayıcı, stimullaşdırıcı istiqamətli olmalıdır.

Qiymətləndirmə apararkən obyektivliyə, elmiliyə, çevikliyə, şəffaflığa riayət edilməlidir. Bütün bunlar qiymətləndirmənin hansı meyarla aparılması ilə sıx əlaqədardır. Ona görə də, ilk növbədə qiymətləndirmənin hansı məqsədlərə uyğun keçiriləcəyini aydınlaşdırmaq, sonra isə parametrlərin necə qiymətləndirilməsini müəyyənləşdirmək lazımdır.

Düzgün həyata keçirilmiş qiymətləndirmənin nəticələri müəllimin fəaliyyəti, bu fəaliyyətin şagirdlərin tələbatına nə dərəcədə cavab verməsi, planlaşdırma və dərsliklərdə müvafiq dəyişikliklərin aparılması zərurəti haqqında qərar qəbul etməyə imkan verir.

Qiymətləndirmə, ilk növbədə şagirdlərdə stimul yaratmalıdır. Müasir qiymətləndirmənin xüsusiyyətlərinə görə müəllim şagirdin səhvlərini deyil, nailiyyətlərini qeyd etməli, cəzadan çox dəstək verməyə çalışmalıdır. Qiymətləndirmə zamanı müəllim şagirdin səhv cavabına “Sən düz demirsən” demək əvəzinə “Bir az düşün, sualımız başqadır”, “Bir daha cəhd et, səndə alınacaq”, “Bir az da fikirləş, məqsədə yaxınsan” kimi həvəsləndirici fikirlərlə dəstək verməlidir. Bu zaman qiymətləndirmədə əks-əlaqə təmin olunar, həm də şagirdin təlimə marağı yüksələr.

Məzmun standartlarının mənimsənilməsi istiqamətində əsasən müxtəlif qiymətləndirmə növlərindən istifadə olunur və onların hər biri qeyd edilən müvafiq məsələlərə aydınlıq gətirmək məqsədi daşıyır.

Məsələn: məktəbdaxili qiymətləndirmə diaqnostik (ilkin səviyyənin qiymətləndirilməsi), formativ (fəaliyyətin qiymətləndirilməsi), summativ (kiçik, böyük və yekun) qiymətləndirmələrdən ibarətdir.

Aydındır ki, diaqnostik qiymətləndir-

mə şagirdin bilik və bacarıqlarının ilkin səviyyəsini müəyyənləşdirməklə müəllim üçün şagirdlərin potensial imkanlarını nəzərə alan təlim strategiyalarının seçilməsinə xidmət edir. Formativ qiymətləndirmə isə şagirdin məzmun standartlarından irəli gələn bilik və bacarıqlara nail olması üçün onun fəaliyyətini izləmək məqsədi ilə aparılır. Bundan fərqli olaraq, summativ qiymətləndirmə təlim prosesində müəyyən mərhələlərə (tədris vahidinin, yarımilin sonunda) yekun vurmaqla, müvafiq məzmun standartlarına uyğun qiymətləndirmə standartları əsasında hazırlanmış vasitələrlə şagirdin nailiyyətini qiymətləndirmək məqsədi ilə aparılır. Beləliklə, diaqnostik, formativ və summativ qiymətləndirmələr sistemli şəkildə yeni fənn kurikulumları tətbiq olunan siniflərdə həyata keçirilir. Təcrübədə təsdiq olunmuşdur ki, ilkin səviyyənin qiymətləndirilməsi (diaqnostik qiymətləndirmə) şagirdin biliyini müəyyən edir və təlimin düzgün qurulmasında müəllimə köməklik göstərir. Təlim prosesində düzgün istiqamətləndirilmiş şagird öyrənilmiş materialın təkrarına vaxt itirmir, həmçinin onun üçün başa düşülməyən və ya tanış olmayan material qalmır. İlkin səviyyə qiymətləndirilməsinin sualları bir-biri ilə elə əlaqələndirilib tənzimlənməlidir ki, onların bəziləri şagirdin hansı biliklərə malik olduğunu, digərləri isə yeni materialı mənimsəmiş şagirdləri müəyyən etsin. Qiymətləndirmə mərhələsi meyarlar üzrə həyata keçirilməlidir. Çünki kurikulum üzrə qiymətləndirmə daha çox şagirdlərin bacarıqlarına əsaslanır. Yəni şagird biliyinə görə deyil, biliyi tətbiqetmə bacarığına görə qiymətləndirilir.

Diaqnostik qiymətləndirmədə aşağıdakı üsullardan istifadə olunur: Müşahidə (müəllim şagirdin təlim fəaliyyətini müşahidə əsasında qiymətləndirir), müsahibə (şifahi yoxlama), tapşırıqvermə, valideynlərlə və digər fənn müəllimləri ilə söhbət.

Bu prosesdə müşahidə vərəqindən (şagirdin təlim fəaliyyətindən gözlənilən nəticəni əks etdirən meyarlar cədvəli), müəllimin qeydiyyat vərəqindən (şagirdlə, müvafiq hallarda qrup, yaxud siniflə aparılan şifahi yoxlama zamanı müəllimin diaqnoz qoymaq istədiyi məsələnin yazıldığı vərəq), həmçinin çalışmalar, söhbət və müəllimin sorğu vərəqindən (şagirdin evdə və ya məktəbdəki fəaliyyəti ilə bağlı suallar yazılmış vərəqdən istifadə olunur).

Müəllimin istifadə etdiyi fəaliyyət növləri də az əhəmiyyət kəsb etmir. Bunlardan dərsdə şagirdin fəaliyyətinin müşahidə edilməsi və meyarlar cədvəlinə qeyd olunması, mövzu üzrə müxtəlif insanlardan müsahibə götürmək, praktik çalışmaların, tapşırıqların yerinə yetirilməsi, valideyn iclasında sorğu vərəqlərinin doldurulması daha məqbul sayılır.

Diaqnostik qiymətləndirməyə dair bir nümunə: “Tərəvəzlərin becərilmə texnologiyası” mövzusundan əvvəl müəllim diaqnostik qiymətləndirmə aparır. Bunun üçün o, müxtəlif tapşırıqlar tərtib edir.

Bununla da müəllim müəyyən edir ki, sinifdəki şagirdlərin mövzu ilə bağlı təsəvvürləri hansı səviyyədədir. Bu isə müəllimə işə hardan başlamaq imkanı verməklə yanaşı şagirdlərə fərdi yanaşmanı təmin edir.

Formativ qiymətləndirmə şagirdin inkişaf göstəricilərini izləməyə kömək olur və heç bir rəsmi jurnalda qeyd edilmir. Formativ qiymətləndirmə müəllimin şəxsi müşahidə kitabçasında qeydlər formasında aparıla bilər. Şagirdin məktəbli kitabçasında isə meyarlar şəklində yazılır. Meyarlar məqsədə uyğun müxtəlif səviyyələrdə hazırlanır. Bu, şagirdin gündəlik dəqiq meyarlarla qiymətləndirilməsini təmin edir və gələcək dərslərdə müəllimin planlaşmasına öz təsirini göstərir. Ortaya çıxan problemlər, geriləmələr summativ qiymətləndirməyə qədər şagirdi inkişaf etdirməyə, onun bilik, bacarıq, vərdişlərini artırmağa kömək edir.

Formativ qiymətləndirmənin üsulları da rəngarəngdir: müşahidə (müəllim şagirdin təlim fəaliyyətini müşahidə əsasında qiymətləndirir), müsahibə (şifahi yoxlama), sorğu, tapşırıqvermə, valideynlərlə və digər

fənn müəllimləri ilə söhbət.

Bu zaman aşağıdakı vasitələrdən istifadə olunur: müşahidə vərəqi (şagirdin təlim fəaliyyətindən gözlənilən nəticəni əks etdirən meyarlar cədvəli), müəllimin qeydiyyat vərəqi (şagirdlə, müvafiq hallarda qrup, yaxud siniflə aparılan şifahi yoxlama zamanı müəllimin diaqnoz qoymaq istədiyi məsələnin yazıldığı vərəq), sorğu vərəqi, çalışmalar, söhbət və müəllimin sorğu vərəqi (şagirdin evdə və ya məktəbdəki fəaliyyəti ilə bağlı suallar yazılmış vərəq).

Formativ qiymətləndirməyə dair nümunəni nəzərdən keçirək.

Formativ rubrik 1.

Standart: 2.2.2.Cərəyan mənbəyindən istifadə etməklə elektrik dövrəsi qurur.

Mövzu: Ən sadə elektrik dövrəsi.

Məqsəd: Cərəyan mənbəyindən istifadə etməklə elektrik dövrəsi qurur.

Meyar: Tətbiqetmə.

I səviyyə - sxemə uyğun dövrə qurarkən səhvlərə yol verir. II səviyyə - dövrəni müəllimin köməyi ilə qurur. III səviyyə - qaydalara əməl etməklə sərbəst dövrə qurur.

Məzmun standartlarının hansı səviyyədə reallaşdığını müəyyən etmək məqsədi ilə nəzərdə tutulan qiymətləndirmə standartlarından summativ qiymətləndirmə vasitələrinin hazırlanmasında istifadə olunur.

Qiymətləndirmə standartları 4 səviyyədə müəyyənləşdirilmişdir.

Yəni qiymətləndirmə vasitələri hazırlanarkən suallar çətinlik səviyyəsinə görə aşağıdakı kimi hazırlanır:

1-ci səviyyə üzrə suallar - 20% 3.2.1.Q.1 Ailə büdcəsi nədir?

2-ci səviyyə üzrə suallar - 30% 3.2.1.Q.2. Ailə büdcəsini müəyyən etmək üçün nələr haqqında bilgi əldə olunmalıdır?

3-cü səviyyə üzrə suallar-30% 3.2.1.Q.3 Gəlir və xərcin müəyyənləşdirilməsinin nə kimi əhəmiyyəti var? Bu haqda fikirlərinizi yazın.

4-cü səviyyə üzrə suallar - 20% 3.2.1.Q 4. Ailə büdcəsinin dəqiq tarazlaşdırılmasının nə kimi əhəmiyyəti vardır?

Əgər 30 sual hazırlanırsa, bu sualların 20% -i birinci səviyyəli suallar, 30%-i II səviyyəli, 30 %-i III səviyyəli, 20%-i isə 4-cü səviyyəli suallar olmalıdır.

Qiymətləndirmə zamanı stimullaşdırma, dəstəkləyici mühit, müəllim-şagird münasibəti, əməkdaşlıq, şagirdlərin maraq səviyyəsi, idrak, inam, ünsiyyət nəzərə alınmalıdır.

*Rəyçi: dos. N.Axundov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasında təhsilin inkişafi üzrə Dövlət Strategiyası.// Azərbaycan məktəbi, 2013, № 5.

2. Təhsil Qanunu. Bakı, 2009.

3. Azərbaycan Respublikasının ümumi təhsil sistemində Qiymətləndirmə Konsepsiyası.// Kurikulum, 2009, № 2.

**Х.Салимова**

**Технология оценивания достижений учащихся**

**Резюме**

В статье дана информация о стандартах и средствах оценивания. Раскрывается механизмы оценивания. Говорится о достижениях оценивания и о возможностях для получения образования. Раскрыта реализация развивающей роли результатов оценивания в деле обучения.

**Kh.Salimova**

**The Tehnology of assessment students acheivements**

**Summary**

The article provides standards and means of evaluation. Reveals mechanisms of evaluation. Refers to the evaluation of achievements and opportunities for education. Disclosed implementation of the developmental role of evaluation results in training.

# ƏCNƏBİ TƏLƏBƏLƏRİN AZƏRBAYCAN DİLİNİ MƏNİMSƏMƏSİ ZAMANI YARANAN PSİXOLOJİ ÇƏTİNLİKLƏR

**Rahilə Cəbrayılova,**
***Bakı Dövlət Universitetinin dissertantı***

***Açar sözlər:*** *əcnəbi tələbələr, bacarıqlar, qabiliyyətlər, tərcümə üsulu, tədris fəaliyyəti, səhvlər, mədəniyyətlərarası əməkdaşlıq, dil öyrənmə, xarici dil.*

***Ключевые слова:*** *иностранные студенты, умения, навыки, способ перевода, учебная деятельность, ошибки, межкультурное сотрудничество, изучение языка, иностранный язык.*

***Key words:*** *foreign students, skills, abilities, translation method, teaching activities, errors, intercultural cooperation, language learning, foreign language.*

Azərbaycan dili respublikamızda yaşayan qardaş xalqlarla azərbaycanlılar arasında ünsiyyət əlaqələrini təmin etmək vasitəsidir. Buradan belə nəticə çıxır ki, tədrisi rus və qeyri-dillərdə olan məktəblərdə Azərbaycan dilinin öyrənilməsi şagirdlərin, ana dilində olduğu kimi, Azərbaycan dilində də gündəlik danışıq təcrübələri vasitəsilə əlaqələndirilməlidir (1). Məşhur dilçi A.İsaçenko yazırdı ki, iki və daha artıq dilin qarşılaşdırılmasının nəzəri əsası vardır. Başqa dilləri müqayisə ilə öyrənmək məqbul sayılır. Həm də çox dil bilən adamlar həssas olurlar. Ona görə də Azərbaycan dili məşğələləri həmin dilin, əsas etibarilə əməli cəhətdən öyrənilməsinə kömək etməli, tədris zamanı istifadə ediləcək mətnlər, təhlil üçün veriləcək misallar və sərbəst çalışmalar şagirdlərin mühiti və həyatı ilə əlaqəli olmalıdır. Bu məqsədlə müəllimlər əcnəbi şagirdləri və tələbələri Azərbaycan dili üzrə lazımi lüğət ehtiyatına yiyələndirmək məsələsinə xüsusi əhəmiyyət verməlidirlər. Azərbaycan dilini öyrənən əcnəbi şagirdlərə və tələbələrə, hər şeydən əvvəl, Azərbaycan sözlərinin lüğət ehtiyatını mənimsədəcək materiallar verilməlidir. Burada, bir tərəfdən, öyrədilən sözlərin çoxluğu, rəngarəngliyi, digər tərəfdən isə, Azərbaycan dilinin lüğət tərkibi zəngin olduğundan, rus məktəblərində oxuyan şagirdlərin (və əcnəbi tələbələrin - R.C.) qüvvəsinə uyğun sözlərin mənimsədilməsi nəzərdə tutulmalıdır. Onlara elə sözlər öyrədilməlidir ki, birinci növbədə şagirdlər bu sözlərdən gündəlik həyatda istifadə edə bilsinlər. Azərbaycan dilindən istifadə etmək imkanına yiyələnsinlər (1).

Xarici dillərin tədrisi metodikası sahəsində bu vaxta qədər daha çox mübahisə doğuran məsələ, əcnəbi şagirdə (və tələbəyə) ikinci dili öyrədərkən, onu ilk dəfə yeni sözlə nə cür tanış etmək üsulu üzərində olmuşdur. Yeni sözü və onun mənasını şagirdə hansı yolla: ana dilində olduğu kimi "müstəqim" və ya "təbii" yolla (məsələn: əşyanı göstərib, sonra adını demək), yoxsa ana dil vasitəsi ilə, yəni tərcümə ilə öyrətmək yaxşıdır? Pedaqoji ədəbiyyatda xarici (ikinci) dilləri öyrətmək üçün aşağıdakı təlim üsulları tətbiq olunur:

1) müstəqim və ya təbii üsul; 2) tərcümə və ya müqayisəli üsul; 3) qarışıq tipli üsul (1).

Müstəqim və ya təbii üsul termininin özündən bəlli olduğu kimi, burada ikinci dili "müstəqim" və ya bilavasitə, ana dilinin heç bir köməyi olmadan öyrətmək nəzərdə tutulur. Müstəqim üsulla aparılan təlimdə əsas yollar: əşyanın bilavasitə göstərilməsi, hadisələrin nümayiş etdirilməsi, şəkillərdən istifadə, rəsm, ekskursiya və canlı danışıqdır. Məşğələni bu üsulla təşkil etdikdə həmin dərsdə ana dilindən qətiyyən istifadə olunmur, çətin sözlər öyrədilən dildə aydınlaşdırılır, tərcüməyə yol verilmir. Bu üsulla dərs verərkən qiraət və yazı ikinci planda qalır, qrammatika və sözlərin tərcüməsi isə üçüncü plana keçirilir. Əgər təkcə şifahi nitq nəzərdə tutulursa, təbii üsulda danışıq və qiraətlə əlaqədar olaraq, uzun müddət qrammatik məlumat vermədən tərcüməsiz məşğələ aparmaq olar.

Müstəqim və ya təbii üsulun müsbət cəhətləri ondan ibarətdir ki, burada təlimin bütün gedişində vaxta qənaət edilir, əşya və hadisəni göstərməklə (müstəqim yolla) onların adları öyrədilir. Bu zaman uşağın diqqəti nəinki ikiləşir (parçalanır), əksinə, bütünlüklə öyrənilmiş söz və ifadələr ətrafında mərkəzləşir.

Təbii üsulun müsbət cəhətlərindən biri də dərsin tamamilə əyani şəkildə keçilməsi, metodik yolların müxtəlifliyi və habelə məşğələlərin canlı dilə və uşağı əhatə edən həqiqi varlığa əsaslanmasıdır. Bu hal, əlbəttə, uşaqlarda dərsə böyük maraq oyadır və onlarda dili mücərrəd, kitab yolu ilə öyrənməyə nisbətən, daha artıq fəallıq yaradır.

Lakin təbii üsulun mənfi cəhətləri də vardır. Bunu vaxtı ilə professor A.Abdullayev görmüş və qeyd etmişdir ki, hər şeydən əvvəl, bu üsulun "təbiiliyi" bəzən süni vəziyyət alır. Çünki biz uşağı hələ bilmədiyi və ona yad olan bir dildə düşünməyə və dərk etməyə məcbur edə bilmərik. Uşaq ətrafda olan əşya haqqında verilən ən adi suala - bu nədir? sualına cavab vermək üçün, əgər həmin əşyanı tanıyırsa, əvvəlcə öz ana dilində düşünüb, sonra həmin əşyanın adını öyrəndiyi ikinci dildə söyləyəcəkdir. Bu vəziyyət əməli cəhətdən çətinlik törədir.

Bu üsulun mənfi cəhətlərindən biri də, əksər hallarda uşaqların öyrəndikləri ikinci dildə yeni sözləri dəqiq qavramamaları, onu təxmini, bəzən də bütünlüklə təhrif etmələridir.

Tərcüməni və qrammatik qaydaları qiymətləndirmək və tələbələri bu istiqamətdə sərbəst işə öyrətmək də təbii üsulun mənfi cəhətlərindəndir. Bu üsulun tətbiqi zamanı ağırlıq mərkəzi bütünlüklə, bilavasitə müəllimin şifahi nitqə aid apardığı işlərin üzərinə düşür və beləliklə, həmin üsul kitabın (o cümlədən dərsliyin) rolunu və tələbənin sərbəst işini qiymətləndirmir.

Azərbaycan pedaqoqlarının fikrincə, müəllimin hər bir yeni söz və ya ifadəni əcnəbi tələbələrin ana dilinə tərcümə etməklə dərs verməsinə tərcümə və ya müqayisə üsulu deyilir.

Bu üsulla məşğələ apardıqda əcnəbi şagirdlər (və ya tələbələr) öyrədilən sözün mənasını əvvəlcə öz ana dillərində, sonra isə öyrəndikləri dildə ifadə etməlidirlər. Fikri sözlə ifadə etdikdə dili təfəkkürdən ayırmaq mümkün olmadığından, onlar anladıqlarını paralel surətdə, həm ana dilində, həm də öyrəndikləri ikinci dildə söyləməlidirlər. Buradan da tərcümə üsulunun tələbinə görə, ana dili və öyrənilən ikinci dilin tədrisində daimi paralelizm məsələsi ortaya çıxır. Bu üsula əsasən yeni bir söz deyilən kimi, dərhal ana dilinə tərcümə olunmalıdır, bir cümlə söylənilib və ya oxundumu, dərhal tərcümə edilməlidir. Beləliklə, şagirdlər həmişə ilk dili – ana dilini öyrənilən ikinci dilin əsasında işləməli olurlar (1).

Tərcümə üsulundan istifadə etdikdə dərsdə kitab və yazı üzərində iş mühüm yer tutur. Tərcümə üsulu, bir növ, kitab üsuludur. Bu üsulu tətbiq etdikdə, öyrənilən dilin qrammatikasına və ümumiyyətlə, dil nəzəriyyəsinə daha çox diqqət verilir. Eyni zamanda həmin dilin qrammatik quruluşu şagirdin ana dilinin qrammatik quruluşu ilə qarşılıqlı və müqayisəli şəkildə öyrədilir. Buna görə də, tərcümə üsuluna müqayisə üsulu da deyirlər (1).

Tərcümə və ya müqayisəli üsulun müsbət cəhətləri aşağıdakılardır:

1) Tərcümə üsulu öyrədilən dilin yeni faktlarını, söz və onun quruluşunu dəqiq qavramağa kömək edir; 2) tədris zamanı kitab, dərslik və yazıdan geniş istifadə edilməsinə imkan yaradır; 3) tələbəni sərbəst (başlıca olaraq kitabla), yalnız sinifdə müəllimin rəhbərliyi ilə deyil, evdə də çalışmağa məcbur edir (1).

Görkəmli tədqiqatçılar tərcümə üsulunun mənfi cəhətlərini də qeyd edirlər. Bunlar, başlıca olaraq aşağıdakılardan ibarətdir:

1) Tərcümə üsulunda tələbənin diqqəti həmişə öz ana dili ilə öyrənəcəyi yeni dil arasında ikiləşir. Bundan başqa, təbiidir ki, bu parçalanmış diqqət şagirddə (əcnəbi tələbədə) öyrəndiyi ikinci dilə nisbətən, ona daha yaxın olan ana dili ətrafında toplanır; 2) tərcümə üsulundan istifadənin ən böyük nöqsanlarından biri öyrənilən dilin ana dilinə həmişə, bir növ, mexaniki surətdə əlavə olunmasıdır; 3) müəllim bu üsulla dərs verərkən ikinci dili öyrətmək üçün şagirdlərə mənası məlum olmayan söz, ifadə və mətnləri verdikdə, bu sözləri ana dilinə tərcümə etməklə məşğul olmalıdır ki, bu da dərsi ana dili dərsinə çevirir; 4) tərcümə üsulunun bir nöqsanı da kitaba, hazır mətnə bağlanıb, ondan asılı olmasıdır. Dili bu üsulla öyrəndikdə tələbə oxuyur, yazır, tərcümə edir, lakin onu kitab və mətndən ayırdıqda o özünü çətin vəziyyətdə, köməksiz hiss etməyə başlayır; 5) tərcümə üsulu vaxta qənaət etmək nöqteyi-nəzərindən də əlverişli deyildir. Bu üsul dili tələbələrə proqramın tələbi səviyyəsində yaxşı öyrətmək üçün tədris planında daha çox saat ayırmağı qarşıya qoyur.

Müəllim qarışıq tipli üsulla dərs dedikdə, əcnəbi tələbəni öyrənilən dillə hərtərəfli tanış etmək üçün (yəni həmin dilin danışıq xüsusiyyətləri, qiraət, qrammatika və yazı qaydaları ilə şagirdləri tanış etmək üçün) bəzən müstəqim, bəzən də tərcümə və ya müqayisə üsulundan istifadə edir. Beləliklə, qarışıq tipli (kombinə edilmiş) üsulla işləyərkən, yuxarıda göstərilən müstəqim və tərcümə üsullarının mənfi cəhətləri atılır, müsbət cəhətlərindən isə istifadə edilir.

Hazırda əcnəbi tələbələrə ikinci dili öyrətmək sahəsində qarışıq tipli üsul daha yararlı və məqsədəuyğun olduğundan, bundan geniş istifadə edilir.

Əcnəbi tələbələrlə aparılan müşahidələr onu göstərir ki, xarici tələbələrin tədris fəaliyyətinin səmərəliliyi müəyyən dərəcədə də onların özünüidarə səviyyəsindən çox asılıdır. Dil öyrənən tələbənin tədris işinin müvəffəqiyyətli olması üçün tələbə, ilk növbədə öz fəaliyyətinə şüurlu şəkildə yanaşmalı, icra edəcəyi işin nəticələrini verilmiş nümunələr ilə tutuşdurmağı və eyni zamanda da ona verilən tapşırığı müstəqil şəkildə yoxlayıb səhvlərini düzəltməyi bacarmalıdır.

Son zamanlar ikidillilikdən çox danışılır. Aydındır ki, danışanın öz fikrini iki dildə çəkinmədən izah etməsi ona elmdə yeni imkanlar yaradır. Təsadüfi deyildir ki, bu işlə ölkəmizdə laboratoriyalar, kafedralar, hətta institutlar məşğul olur. Bu mənada Azərbaycan dilini öyrənən əcnəbi tələbələr həmin dilə aid olan materialları, sözləri və onların düzgün tələffüzünü yadda saxlamalı, böyük zehni və əməli fəaliyyət göstərməyi

bacarmalıdırlar. Qeyd etmək lazımdır ki, Azərbaycan dilini öyrənən hər hansı bir əcnəbi tələbəyə bu dili öyrədərkən tələbənin marağı xüsusilə nəzərə alınmalıdır. Əgər tələbənin marağı nəzərə alınmazsa, onda bu işdə müəllimin peşəkarlığından danışmağa dəyməz. Əcnəbi tələbələr üçün seçilən materiallar hər dəfə yeni məzmunda olmaqla yanaşı, praktik xarakter daşımalıdır. Əcnəbi tələbənin dilə praktik şəkildə yiyələnməsi müəllimin peşəkarlığından çox asılıdır. Belə ki, müəllim görəcəyi işlərin planını vaxtında müəyyənləşdirmiş olarsa, bu, tədris işinin keyfiyyətinə xeyli təsir edər və bu planda kommunikativlik məsələsini də göz önündə tutmaq lazımdır. Bu hal şifahi nitqin inkişafına gətirib çıxarır ki, bunun nəticəsində də dil dərslərində mövcud olan çətinliklər aradan qalxır. A.Komarov göstərir ki, tələbənin biliyindəki gerilik ona mənfi təsir göstərir, bu da öz növbəsində tədris prosesinə pis təsir edir. Bu baxımdan da, bəzi alimlərə görə, xarici dili öyrənən tələbələrə dil dərslərinin effektivliyi kollektiv şəraitdə dərskeçmə ilə mümkün ola bilər.

Pedaqoji psixologiyada səhvlər və onların təlimdəki rolundan da bəhs edilib. Bir çox psixoloqlar onların təhlilini, ümumiyyətlə, öyrənilməsini inkar edirlər. Onlar belə iddia edirlər ki, ən yaxşısı səhv etmək lazım deyil ki, buraxılan səhvləri öyrənək. Ancaq A.A.Leontyev göstərir ki, birincisi, müasir metodikanı məhz səhvlərdə təzahür edən, onun “zəif yerləri”ni bilmədən əsaslı şəkildə yaxşılaşdırmağa nail olmaq qeyri-mümkündür. İkincisi, səhvlər nitq mexanizminin düzgün, normal fəaliyyətinin tədqiqinin ən mühüm vasitələrindən biridir (7).

Müəllif ümumi nitq səhvi dedikdə öz genezisinə görə müxtəlif hadisəni nəzərdə tutur. O, nitq səhvlərini aşağıdakı kimi təsnif edir: “Birincisi, bu səhv nitq əməlidir… İkincisi, nitq əməlinin səhv proqramlaşdırılmasıdır. Üçüncüsü, ən geniş yayılmış səhv nitq əməliyyatıdır. Bu səhvlərdən ən tipik olanı söz axtarışı səhvi və qrammatik vəzifələrin düzgün reallaşdırılmasıdır. Dördüncü səhv hər hansı dil daşıyıcısının yazılı və şifahi nitqində olan səhvlərdir. Buraya hər cür təkrarlamalar aiddir”.

Z.M.Svetkova müxtəlif səhvləri fərqləndirir və əsas səhvlərdən biri kimi xarici dilə doğma dil normalarının gəlməsi ilə baş verən səhvləri əsas hesab edir (8).

Psixoloqlar səhvlərin keyfiyyət səciyyəsini verməkdən başqa onların kəmiyyətcə təhlil edilməsini də iddia edirlər. Bu fikri daha çox B.F.Voronin müdafiə edir. O, “tipik” və “sabit” səhvlər anlayışlarını fərqləndirmişdir (4).

Tipik səhvlər ikinci dil öyrənənlərdə mənimsəmənin ümumi qanunauyğunluqlarında və ya təlimin xüsusiyyətlərində, öyrənilən və doğma dillərin qarşılıqlı münasibətlərində özünü göstərir. Sabit səhv təlim zamanı bir neçə il ərzində qalan səhvlərdir. B.F.Voronin səhvlərin təsvib edilməsini deyil, bu barədə xəbərdar edilməsinin önə çəkilməsini göstərir (5).

Ümumiyyətlə, nitqdə və dil təlimində səhvləri araşdırmaq və onların aradan qaldırılması ciddi psixolinqvistik problem olaraq qalmaqdadır.

XX əsrin sonlarında Azərbaycan müstəqillik qazandıqdan sonra respublikamızın xarici ölkələrlə hərtərəfli əlaqələri daha da genişləndi. Bununla əlaqədar Azərbaycan dilinin tədrisi sahəsində yeni vəzifələr irəli sürüldü. Azərbaycan dilinin öyrənilməsi iki istiqamətdə zərurətə çevrildi:

1) Müxtəlif funksiyaları həyata keçirən xarici vətəndaşlara Azərbaycan dilinin intensiv yolla öyrədilməsi;

2) Əcnəbi tələbələrə Azərbaycan dilinin öyrədilməsi yolları.

Azərbaycan dilinin öyrənilməsində köməkçi iş formalarından: ekskursiyalardan, ədəbi gecələrin təşkilindən, kollektiv qiraət-

dən, dərnəklərdən, azərbaycan məktəblərində divar qəzetinin buraxılmasından, rus məktəblərində əcnəbi tələbələr üçün Azərbaycan dili guşəsinin yaradılmasından və s. formalarından istifadə edilə bilər.

Texniki vasitələr şagirdin duyğu üzvlərinə təsiretmə prinsipinə görə təsnif olunduqda, onları üç yerə bölmək olar:

1) akustik aparatlar – eşitmə üzvlərinə təsir edir;

2) vizual aparatlar - görmə üzvlərinə təsir edir;

3) akustik-vizual aparatlar isə həm eşitmə, həm də görmə üzvlərinə təsir edir.

Akustik texniki vasitələr dörd qrupa bölünür:

a) radioqəbuledicilər; b) məktəb-radio qovşağı; c) elektronlar; ç) fonoxrestomatiyalar.

Vizual texniki vasitələrə metodik ədəbiyyatda ekran vasitələri deyilir. Bunların bir neçə növü var:

1) Epidiaskop. Bu özü də iki yerə bölünür: a) episkop; b) diaskop.

2) Epilent. Epiproyeksiya materiallarının müəyyən ardıcıllıqla düzülüşünə epilent deyilir.

3) Filmoskop. Bu, dil müəllimlərinin ən çox istifadə etdiyi vizual aparatlardan biridir.

Yuxarıda adları çəkilən texniki vasitələrin təlim işində böyük əhəmiyyəti vardır. Texniki vasitələrdən istifadə, hər şeydən əvvəl, təlimin əyaniliyini yüksəldir. Texniki vasitələr keçilən mövzuya dair dolğun və dəqiq məlumat verir, təlimin effektivliyini və şagirdlərin mövzunu mənimsəməsinin sürətini artırır, materialın uzun müddət yadda qalmasını təmin edir, həm şagirdlərin dərsə marağını artırır, həm də müəllimin işini yüngülləşdirir.

Göründüyü kimi, texniki vasitələr, həqiqətən, dövrün tələblərinə cavab verən çox faydalı vasitədir. Ona görə başqa fənn müəllimləri kimi, Azərbaycan dili müəllimləri də texniki vasitələrdən istifadə etməlidirlər (2).

Tədrisi rus dilində olan məktəblərdə əcnəbi tələbələrə öyrədilən Azərbaycan dilinin əsas tədris forması dərsdir. Dərsdə texniki vasitələrdən – radio, televizor, maqnitofon, kompyuter, internet və İKT-dən istifadə edilir. İkinci dil – xarici dil kimi öyrənilən Azərbaycan dilinə belə halda rus və əcnəbi tələbələrdə maraq yarana bilər.

Beləliklə, Azərbaycan dilinin əcnəbi tələbələrə öyrədilməsi onlarda milli mədəniyyətimizə tolerant münasibətin formalaşmasına səbəb olur. Əcnəbi və yerli tələbələrin birgə fəaliyyəti prosesində “etnik tolerantlıq əsasında mədəniyyətlərarası dialoq şəraitində şəxsiyyətin psixososial xarakteristikasının şüurunda münaqişəsiz davranış yönümün üstünlüyünün yaranması” (3) baş verir.

Ali məktəblərdə tədris-təlim prosesində azərbaycanlı və əcnəbi tələbələrin mədəniyyətlərarası əməkdaşlığı qarşılıqlı təsirlə yanaşı, xalqların milli özünəməxsusluğunun qorunmasını da önə çəkir. “Bununla əlaqədar olaraq ali məktəb sistemi qarşısında müasir tələblərin mədəni müxtəlifliyinin gənclərin öz doğma mədəniyyəti ilə yanaşı dünya mədəniyyətinə qovuşmasına səbəb olan müxtəlif mədəniyyətlərin zənginləşdirici potensialını sintezləşdirən dəyər məna yönümü axtarışları vasitəsinə çevrilməsi durur. Bu məsələnin həllində tələbələrdə başqa mədəniyyətə dəyər münasibətinin formalaşması xüsusi əhəmiyyət kəsb edir” (3).

Belə münasibətlər zamanı ikili proses baş verir. Həm əcnəbi tələbələrin davranış, ənənə və adətlərinə müsbət emosional münasibət yaranır, həm də əcnəbi tələbələr dilini öyrəndikləri xalqın mədəniyyətinə hörmət hissi ilə yanaşırlar. Bir sözlə, əcnəbi və yerli tələbələr arasında qarşılıqlı anlaşma, qarşılıqlı inam və mədəniyyətlərarası əməkdaşlıq yaranır. Belə şəraitdə yalnız mədəniy-

yətlərin dialoqundan bəhs etmək olmaz. Belə əməkdaşlıq bir-birinə qarşı tolerantlıq, mədəniyyətlərin qarşılıqlı zənginləşməsinə də səbəb olur. Nəzərdə tutmaq lazımdır ki, "respublikamızda ikidillilik siyasəti yalnız və yalnız ana dilini-respublikanın milli dilini ön plana çəkməklə həyata keçirilməlidir" (6).

*Rəyçi: dos. P.Paşayeva*

**İstifadə edilmiş ədəbiyyat**

1. Abdullayev A. Rus dili məktəblərində Azərbaycan dilinin tədrisi. Bakı: Maarif, 1971.

2. Abdullayev A. Orta məktəblərdə Azərbaycan dilinin tədrisi. Bakı: Maarif, 1978.

3. Бурыкина В. Ценностное отношение к иной культуре как условие формирования сотрудничеству //www.rusnauka. com.

4. Воронин Б. К проблеме типичности и устойчивости ошибок и речи// Психология и методика обучения второму языку (критерии отбора языкового материала). Тезисы сообщений. Москва: Изд-во МГУ, 1987.

5. Воронин Б. Ошибки в устной речи иностранца как психолингвистическая проблема.// Психология грамматики. Москва: Изд-во МГУ, 1988.

6. Veysəlli F. Seçilmiş əsərlər. I cild. Bakı: Mütərcim, 2009.

7. Леонтьев А. Некоторые проблемы изучение русского языка как иностранному. Москва: Просвещение, 1989.

8. Цветкова М. Советская методика преподавания иностранных языков// Материалы VIII Международного Методического Семинара. Москва: Изво МГУ, 1984.

9. Gözəlova S., İmanova S. Texniki ali məktəblərin qruplarında Azərbaycan dili tədrisinin bəzi məsələləri. //Azərbaycan məktəbi, 2013, №5.

**Р.Джабраилова**

**Психологические трудности, возникающие при усвоении азербайджанского языка иностранными студентами**

**Резюме**

В статье рассматриваются психологические трудности, возникающие у иностранных студентов при изучении азербайджанского языка в педагогическом аспекте. Автор подчеркивает, что как и у всех иностранных языков, при изучении азербайджанского языка используются возможности перевода или же изучается словарный состав и смыслы слов. Указаны пути преодоления психологических трудностей при изучении иностранцами азербайджанского языка.

**R.Jabrayilova**

**Psychological difficulties in the assimilation of the Azerbaijani language foreign students**

**Summary**

The article deals with the psychological difficulties encountered by foreign students in the study of the Azerbaijani language in the pedagogical aspect. The author points out that, as in all languages, the study of the Azerbaijani language translation capabilities are used or studied vocabulary and meanings of words. Ways to overcome the psychological difficulties in the study of foreign Azerbaijani language.

***Qiymətləndirmə***

# KOMPETENSİYALARA ƏSASLANAN MODUL PROQRAMLARI (KURİKULUMLAR) ƏSASINDA ŞAGİRD NAİLİYYƏTLƏRİNİN QİYMƏTLƏNDİRİLMƏSİ

**Rəsul Əsgərov,**
***Təhsil Problemləri İnstitutunun peşə-ixtisas təhsili şöbəsinin müdiri, əməkdar müəllim***

**Malik Qurbanov,**
***həmin şöbənin böyük elmi işçisi***

***Açar sözlər:*** *dövlət strategiyası, strateji istiqamətlər, kompetensiyalara əsaslanan modul tipli təhsil proqramları, yeni təhsil proqramları (kurikulumlar), ilk peşə-ixtisas təhsili, xüsusi qayğıya ehtiyacı olanların təhsili, ilk peşə-ixtisas təhsili müəssisələrinin maliyyələşdirilməsi, şagird-müəllim nisbəti.*

***Ключевые слова:*** *государственная стратегия, стратегические направления, основанные на контитенцию образовательные программы модульного типа, новейшие образовательные программы (курикулумы), начальное профессионально-специальное образование, образование нуждающихся в особой заботье, финансирование начальных профессиональных специальных образовательных заведений, соотношение учителей и учащихся.*

***Key words:*** *state strategy, strategic directions, module education programs based on competence, new education programs (curiculas), first profession-based education, education for disabled people, financialization of the first profession-based education, student-teacher ratio.*

Beynəlxalq təcrübəyə əsaslanan ilk peşə-ixtisas təhsili sisteminin islahat siyasəti və strategiyasının mərkəzində bacarıqların inkişaf etdirilməsi, onun əmək bazarının tələbatlarına və iş yerində əmək fəaliyyətinin məqsədlərinə istiqamətlənmiş sistemə çevrilməsi dayanır. Bu cür sistem, əsasən, təlimin razılaşdırılmış nəticələrindən və təlim prosesinin keyfiyyətindən çıxış edərək formalaşdırılmalıdır.

Ölkəmizdə gerçəkləşdirilən islahatlar və genişmiqyaslı infrastruktur layihələri, dayanıqlı makroiqtisadi yüksəlişin təmini, yoxsulluğun azaldılması, iqtisadiyyatın diversifikasiyası və onun dünya iqtisadi sisteminə inteqrasiyası insan potensialının inkişafı üzrə qəti tədbirlərin həyata keçirilməsini tələb edir. Bu isə öz növbəsində təhsilin keyfiyyətinin yüksəldilməsi və rəqabətqabiliyyətli kadr potensialının hazırlanması ilə bağlıdır. Göstərilən məsələlərin həlli üçün zəruri şərt ilk peşə-ixtisas təhsili sistemində kadr hazırlığının əmək bazarının tələblərinə uyğunluğunun təmin edilməsidir.

Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 24 oktyabr tarixli Sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" (bundan sonra - Dövlət Strategiyası işlədiləcək) Azərbaycan Respublikasında, keyfiyyət

nəticələri və əhatəliliyinə görə dünya ölkələri sırasında aparıcı mövqe tutan, səriştəli müəllim və təhsil menecerlərinə, qabaqcıl texnologiyalara əsaslanan infrastruktura malik təhsil sisteminin yaradılması üçün aşağıdakı beş strateji istiqamətdə genişmiqyaslı tədbirləri nəzərdə tutur: S ə r i ş t ə y ə əsaslanan şəxsiyyətyönlü təhsil məzmununun yaradılması.

• Təhsilalanların fərdi xüsusiyyətlərini nəzərə alan innovativ təlim metodları və texnologiyaları vasitəsilə təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən yüksəknüfuzlu təhsilverənin formalaşdırılması.

• Təhsilin nəticələrə görə cavabdeh, şəffaf və səmərəli tənzimləmə mexanizmlərinə malik, dövlət-ictimai xarakterli və dövlət-biznes partnyorluğuna əsaslanan idarəetmə sisteminin formalaşdırılması.

• Müasir tələblərə cavab verən və ömürboyu təhsili təmin edən təhsil infrastrukturunun yaradılması.

• Təhsilin dayanıqlı və müxtəlif mənbələrdən istifadə olunmaqla yeni maliyyələşdirmə mexanizminin yaradılması.

Dövlət Strategiyasının mühüm xüsusiyyətlərindən biri ondan ibarətdir ki, ilk peşə-ixtisas təhsili sistemində tədrisin məzmununun müasirləşdirilməsi əmək bazarının geniş müstəvisində əhatə olunur. Bu, o deməkdir ki, istər iqtisadi, istərsə də sosial baxımdan uğurlu və səmərəli peşə təhsili sisteminin formalaşması və fəaliyyət göstərməsinə zəmanət olan zəruri şərtlərdən biri ilk peşə-ixtisas təhsilinin məzmununun müasir əmək bazarının tələblərinə uyğunlaşdırılmasıdır.

Qiymətləndirmə - şagirdin təlim fəaliyyətinin təlimin məqsədlərinə uyğunluğunun kəmiyyət və keyfiyyət göstəricisinin formalaşdırılması prosesidir. Qiymət - əvvəlcədən müəyyən edilmiş meyarlara əsasən təhsilalanın fəaliyyətinin sübutlarının hazırlanması, toplanması və bu sübutlara nəzərən mülahizə yürütmək prosesidir. Hər bir konkret modulun mənimsənilməsinin qiyməti təhsilalanın bu modulun məqsədində formalaşdırılmış tələb olunan kompetensiyaları mənimsəməsini nümayiş etdirməsi və ya təsdiqləməsidir. Təhsilalanlar tərəfindən modulların mənimsənilməsinin qiymətləndirilməsi aşağıda göstərilmiş prinsiplərə əsaslanmalıdır:

• Qiymətin kompetensiyalara əsaslanan texnologiyalar çərçivəsində qiymətləndirmə meyarlarına əsaslanması;

• qiymətləndirmə meyarlarının təlim nəticələrinə (modulun məqsədinə) uyğun formalaşdırılması;

• qiymətin təhsilalanın mənimsəmə sübutlarına əsaslanması;

• sübutların fasiləsiz olaraq bütün təhsil müddəti boyunca toplanması, yəni kompetensiyaların mənimsənilməsinin sübutları əvvəlcədən müəyyən edilmiş yoxlama vaxtlarında, həmçinin yekun qiymətləndirmənin gedişi prosesində toplanması;

• modulun mənimsənilməsinin yekun qiymətləndirmə sübutları da daxil olmaqla toplanmış bütün sübutlar əsasında qiymətləndirilməsi.

İlk peşə-ixtisas təhsili müəssisələrində tədris prosesi mövcud tədris plan və proqramlar (kurikulumlar) əsasında aparılır. Bura ümumtəhsil fənləri, ixtisas üzrə nəzəri təlim fənləri və istehsalat təlimi daxildir. Hazırda ilk peşə-ixtisas təhsili sistemində cari qiymətləndirmə, yarımillik qiymətləndirmə, illik qiymətləndirmə, imtahan və yekun qiymətləndirmə formalarından istifadə olunur. Seçmə yolla şagirdlər keçilən mövzular üzrə gündəlik qiymətləndirilir. Qiymətləndirmə zamanı şifahi sual-cavab, yazılı sual-cavab və ya yazılı çoxcavablı test üsulundan istifadə edilir.

Qiymətləndirmə ilə bağlı dünya təcrübəsi də öyrənilmişdir. Məsələn: Birləşmiş Krallıqda Təhsil Proqramı (modul) Kvalifikasiyalar və Kurikulum İdarəsi (KKİ) tərəfindən akkreditasiya edilir. İxtisasın təhsil səviyyəsi Milli İxtisas Çərçivəsi ilə

müəyyən edilir.

Burada bütün təhsil modulları üçün standart format mövcuddur, bu formatda ixtisasla bağlı şagirdlərə, müəllimlərə və qiymətləndirənlərə, həmçinin milli standartlara uyğunluğu monitorinq edənlərə qoyulan tələblərə dair aydın təlimatlar verilir.

Modulun tərkib hissələrinə diqqət yetirilir.

Tədris saatları modulun məzmununun ölçü vahididir. Buraya birbaşa tədrisə, istehsalat təliminə və qiymətləndirməyə, tədrisin digər formaları olan təyinatlara və ya fərdi tədrisə ayrıla biləcək vaxt daxildir. Buraya şagirdin təşəbbüsü ilə icra edilən özəl təlim daxil deyil. Spesifikasiyaya aid olan təhsil proqramları (kurikulumları) hazırlanarkən təhsilverənlərə bunu nəzərə almaları məsləhət görülür.

Modulun xülasəsi modulun ixtisas daxilində dəyərini və modulun əsas məzmunu barədə məlumatları özündə əks etdirir. Burada təhsilalana modulun məqsədləri və modul üzrə təhsil alarkən əldə edilən əsas bilik, bacarıq və anlayışlar barədə məlumat verilir. Modulun xülasəsində, eyni zamanda, ixtisas sahəsinə (sektora) nə təklif edildiyini təsvir etməklə modulun ixtisas sahələri ilə əlaqələri göstərilir.

Təlim nəticələrində təhsilalanın modulu bitirdiyi zaman hansı kompetensiyalara malik olacağı (nəyi biləcəyi, anlayacağı və bacaracağı və s.) aydın şəkildə qeyd edilir.

Modulun məzmunu hər bir təlim nəticəsinə nail olmaq üçün hazırlanan və tədris edilən proqram üzrə lazım olan bilik, bacarıq və anlayışların dərinliyi və miqyasını müəyyənləşdirir. Bunun üçün müvafiq Milli Peşə Standartlarında qeyd edilmiş bilik və anlayışlardan istifadə edilir. Modulun məzmununda təhsil proqramı (kurikulum) üçün lazımi materiallar qeyd edilir və proqramı uğurla bitirib qiymət almaq üçün lazım olan bacarıq, bilik və anlayışlar təsvir edilir. Hər bir təlim nəticəsi tam olaraq qeyd edilir və daha sonra ona aid olan əsas ifadə və ya konsepsiyalar qeyd edilir, ondan sonra isə müvafiq mövzuların siyahısı verilir.

Modulun məzmunu bölməsində, adətən, qiymətləndirmə meyarını ödəmək üçün əhatə edilməli materialları özündə əks etdirən mövzular qeyd edilir.

Qiymətləndirmə meyarları

Hər bir qiymətləndirmə meyarları bölməsində şagirdin təlim nəticəsini öyrənib qiymət alması üçün göstərməli olduğu sübutların müəyyən edilməsində istifadə edilən meyarlar öz əksini tapır.

Rumıniya təcrübəsinə müraciət edək. Burada Milli (təhsil proqramlarında) kurikulumlara yerli səviyyədə dəyişikliklər etməyə imkan vardır. Kurikulumlar (təhsil proqramları) Təhsil Nazirliyi tərəfindən təsdiq edilir.

Qiymətləndirmə və sertifikatlaşma keyfiyyət strategiyasının 7 əsas komponentindən biri hesab edilir. Strategiyanın digər komponentləri aşağıdakılardır:

1. Keyfiyyətin idarə edilməsi.
2. İdarəçilik öhdəlikləri.
3. Resursların idarə edilməsi.
4. Dizayn və inkişaf.
5. Təlim və tədris.
6. Təhlil və təkmilləşdirmə.

Qiymətləndirmə təhsil standartlarına əsaslanır. Burada ixtisası əmələ gətirən təlim nəticələrinin modulları təsvir edilir. Xarici qiymətləndirmə mərkəzlərində davamlı qiymətləndirmə və yekun qiymətləndirmədən istifadə edilir.

Kompetensiyalara əsaslanan təlim şagirdin fəallığı üzərində qurulduğundan şagird də öz fəaliyyətini əldə edəcəyi kompetensiyaların mənimsənilməsi üzrə qurur. Buna görə də şagird təlimini özü idarə etdiyindən qiymətləndirmə məsuliyyətini də öz üzərinə götürmüş olur. Qiymətləndirmə hissələr üzrə bilik və bacarığı ayrılıqda deyil, kompetensiyaların tam mənimsənilməsini əhatə edir.

Kompetensiyalara əsaslanan modul təlimində qiymət şagirdlərə fərdi yanaşmaqla onların hazırlığı tərzdə qiymətləndirilmə-

sini nəzərdə tutur. Əgər təhsilalan qiymətləndirməyə hazır deyilsə, ona yenidən özünü sınamaq imkanı verilir. Keyfiyyətli qiymətləndirməni xarakterizə edən əlamətlər aşağıdakılardır:

• Adekvatlıq - qiymətləndirmə vasitələrinin yalnız təlimin nəticəsi sayılan fəaliyyəti qiymətləndirməsi, qiymətləndirən şəxslərin hamısının eyni meyarlardan istifadə etməsi.

• Etibarlılıq - bütün təhsilalanlar üçün bərabər şəraitin yaradılması (şagirdlərin hamısının sorğu materiallarından və məlumat xarakterli cədvəllərdən istifadə etməsi imkanı və s.), qiymətləndirən şəxsin nəticənin yalnız qiymətləndirilən şəxsin fəaliyyəti nəticəsində əldə edilməsinə tam əmin olması, biliyin qiymətləndirilməsinin yaddaşa deyil, konkret əmək fəaliyyətinə tətbiqinə əsaslanması.

• Təmin olunma – qiymətləndirmə prosedurunun tələb olunan resurslarla təmin olunması.

• Çeviklik – qiymətləndirmənin təhsilalanların qiymətləndirilməyə tam hazır olduqları halda aparılması, yəni təhsilalanın konkret kompetensiyanı nümayiş etdirməyə hazır olduğu tərzdə qiymətləndirilmənin aparılması.

Bütün bu şərtlər gözlənildikdə qiymət təlim prosesinin təbii və konstruktiv komponentinə çevrilir. Eyni zamanda motivasiya faktoru kimi təhsilalanın əldə etdiyi nəticəyə görə rəğbətləndirilməsi və ya yenidən təlimə ehtiyacının meydana çıxması kimi öyrədici xarakter daşıyır.

Şagird nailiyyətləri cari və yekun qiymətləndirilmə şəklində aparılır. Hər bir modul üzrə fəaliyyətin mənimsənilməsi qiymətləndirilir, sonra isə bütün fəaliyyətin mənimsənilməsi üzrə yekun qiymətləndirmə aparılır. Yekun qiymətləndirmə tapşırıqları inteqrasiya funksiyasını yerinə yetirir. Şagird tələb olunan əmək qabiliyyətini nümayiş etdirir.

Qiymətləndirmə prinsiplərinə ciddi riayət olunur.

Qiymətləndirmənin başlıca məqsədi təlim nailiyyətlərinin təsdiq olunmasını təmin etməkdir. Bu təsdiq olunma bir sıra modulları uğurla başa çatdırdıqdan sonra verilən ixtisaslaşma sertifikatı formasında və ya tam proqramı bitirdikdən sonra verilən ixtisas diplomu formasında ola bilər. Etibarlı olması üçün qiymətləndirmə bəzi prinsiplərə: həqiqilik; etibarlılıq; uyğunlaşma; sadəlik (bəsitlik yox!); haqq və ədalətlilik və b. əsaslanmalıdır.

Qiymətləndirmə aşağıdakı hallarda həqiqi sayıla bilər:

• Məqsədəmüvafiqdir;

• təhsilalana spesifikasiyada müəyyən olunmuş standartlarla birlikdə qiymətləndirilə bilən kifayət qədər icra sübutları hazırlamağa imkan verir;

• təhsilalana xarakteristika standartlarını təmin etməyi tələb edən kifayət qədər bilik, anlayış və bacarıqlara dair sübutlar hazırlamağa imkan verir;

• bütün qiymətləndiricilərin təhsilalanlar haqqında ümidverici qiymətləndirmə qərarları verməsinə imkan verir.

Etibarlılıq təhsilalanların qiymətləndiriciyə verdikləri cavablarının nəzərdən keçirildiyi ardıcıllıq dərəcəsinin ölçülməsidir. Etibarlı olması üçün təhsilalanların fəaliyyətlərinə dair qiymətləndirmə qərarları eyni qiymətləndirmə tapşırığını yerinə yetirən bütün təhsilalanlar üçün uyğun olmalıdır.

• Ardıcıl olaraq tətbiq olunan qiymətləndirmə şərtləri əsasında hazırlanmış əsl qiymətləndirmə ilə verilsin;

• qiymətləndirmə müxtəlif vəziyyətlərdə, kontekstlərdə və müxtəlif təhsilalanlara tətbiq edilən bütün qiymətləndiricilər üçün uyğun olsun;

• aydın müəyyən olunan icra standartları əsasında götürülsün;

• təhsilalanların təsdiq olunmuş işi qiymətləndirilsin;

• zaman keçdikcə onlar davamlı olsun.

Qiymətləndirmədə uyğunlaşma qabiliyyəti, sadəlilik, haqq və ədalətlilik

gözlənilməlidir. Qiymətləndirmənin növləri bu işin istiqamətini təyin edir.

Qiymətləndirmə formativ və ya summativ ola bilər. Formativ qiymətləndirmə təlim prosesinin bir hissəsi kimi aparılıb təhsilalana yardım etməyi və onu verilmiş modul üçün gözlənilən təlim nəticələrinin nailiyyətləri ilə bağlı lazımi bilik, bacarıq və münasibətlərin qurulmasına doğru yönəltməyi nəzərdə tutur.

Summativ qiymətləndirmə, adətən, bir və ya bir neçə təlim nəticələri və ya modulları üzrə təlim prosesinin yekunlaşdırılması ilə bağlıdır və təhsilalanın bütün təlim nəticələrinə nail olub-olmadığını, ona sertifikat və ya diplomun verilmə imkanını müəyyən etməyi nəzərdə tutur.

Qiymətləndirmə bir sıra fərqli mühitlərdə baş tuta bilər, məsələn, sinif otaqları, akt zalları, iş yerləri (və ya iş yeri şəraitlərinin simulyasiyası), ictimai və təlim müəssisələrində və yaxud da imtahan zallarında. Onun harada və ya hansı formada keçirilməsindən asılı olmayaraq, qiymətləndirmə həmişə müşahidəni, nəticənin qiymətləndirilməsini və sorğunu əhatə edir.

Xüsusi bir nəticə və ya nəticələr üzrə qiymətləndirmə vasitəsini seçməzdən əvvəl, nəticə(lər)nin qiymətləndirilməsi və müşahidəni, məhsulun qiymətləndirilməsini və ya sorğunu, ya da hər üçünün birləşməsini əhatə etməsini nəzərə almaq yararlı olardı. Bu qiymətləndiriciyə imkan verəcək ki, o daha uyğun qiymətləndirmə vasitəsinin seçilməsi prosesinə başlasın.

Təhsilalanın fəaliyyətinin müşahidə olunması da vacibdir.

Qiymətləndirici təhsilalanları müşahidə edir, çünki onlar ixtisas üzrə standartlarda müəyyən olunan tapşırıqları yerinə yetirirlər. Müşahidə çox vaxt iş yerində və ya iş yerinə uyğun şəraitlərdə baş verir. Lakin bu laboratoriyada, emalatxanada və ya təhsilalanın praktik fəaliyyətləri yerinə yetirdiyi başqa bir məkanda da yerinə yetirilə bilər.

Qiymətləndiricilər müşahidənin təlim mühitində təbii baş verən istənilən bacarıqlar və ya fəaliyyətlərdən, həmçinin mümkün resurslardan səmərəli istifadə edə bilməsini planlaşdırmalıdırlar.

Təhsilalanın təqdim etdiyi məhsulların qiymətləndirilməsi

Bəzi sahələrdə təhsilalanlar öz ixtisaslarına nail olmağa cəhd etdiklərindən gördüyü işlərin məhsulları formasında sübutlar toplayırlar. Təhsilalanın təqdim etdiyi bir sıra məhsulları təhlil etməklə qiymətləndirici təhsilalanın təlim nəticəsi üzrə tələb olunan bilik və bacarıqlara nail olmasını qiymətləndirə və bu haqda qərar verə bilər. Məhsulun qiymətləndirilməsi ilə bağlı çox mühüm aspekt məhsulun həqiqiliyini təmin etməkdir, yəni məhsul, həqiqətən də, təhsilalanın gördüyü işin nəticəsidir.

Təhsilalanın dərk etmə bacarığının qiymətləndirilməsinə də ciddi riayət olunmalıdır.

Dərketmə bacarığını qiymətləndirmək üçün ilkin olaraq sorğudan istifadə olunur. Qiymətləndirici bilik, anlayış və düşüncə, planlaşdırma, təhlil etmə və mülahizəyürütmə kimi müxtəlif bilik metodlarını qiymətləndirmək istədikdə də təhsilalanın dərk etmə bacarığından istifadə edə bilər.

Bununla belə, sorğu summativ qiymətləndirmə ilə məhdudlaşdırılmır, ondan aşağıdakı sahələr üzrə də istifadə oluna bilər:

• Fəaliyyət nəticəsində aydın olmayan sahələrdə bilik və anlayışı təsdiq etmək üçün;

• bilikdə olan boşluqlara və icrayönümlü modullarda anlayışa ünvanlanmaq üçün;

• təhsilalan sübutun bir hissəsini izah etməyi və yaxud onun hazırlanma prosesini təsvir etmək istədikdə, sübutları təsdiq etmək üçün;

• bacarıq və ya fəaliyyətin müşahidə

olunmasına qədər gözləməyin praktik və ya təhlükəsiz olmayacağı imkanlarını qiymətləndirmək üçün.

Qiymətləndirici qiymətləndirilən modulların nəticələri üzrə tələblərdən və qiymətləndirmə şəraitlərindən asılı olaraq şifahi və ya yazılı suallardan istifadə edə bilər. Metodun seçilməsi təhsilalanlarda ola biləcək hər hansı xüsusi qiymətləndirmə tələblərini əks etdirməlidir. Məsələn: bəzi təhsilalanlar yazılı suallara yaxşı cavab vermir – istənilən halda, həmişə müvafiq oxu səviyyəsindən istifadə olunması təmin olunmalıdır.

Qiymətləndirmənin əsas xüsusiyyətləri bir sıra aspektlər ilə bağlıdır. Məsələn: tələb olunan sübutlar, qiymətləndirməni aparan şəxslər, qiymətləndirmənin aparıldığı müəssisələr, prinsiplərin tətbiqi, keyfiyyətə zəmanət çərçivəsi və s.

Bacarığı qiymətləndirərkən təhsilalanlar yerli səviyyədə təsdiq olunmuş təlim modullarında müəyyən olunan icra meyarları əsasında qiymətləndirilirlər. Bu, təhsilalanların təlimə giriş əsasında və sonra isə istinad olunan norma ilə qiymətləndirildiyi sistemdən tamamilə fərqlidir, o, təhsilalanlardan gözlənilən orta nəticələrə istinad edir.

Qiymətləndiricinin xüsusiyyətlərindən danışarkən qeyd etmək lazımdır ki, bacarığın qiymətləndirilməsi spesifik əsas fəaliyyətlər, icra meyarları və açıqlamalar ilə təlim funksiyalarından çox fərqli olan funksiyaları nəzərdə tutur.

Təlim nəticələrini (nailiyyətləri) qiymətləndirən müəllim və ya təlimçi kompetensiyalara əsaslanan və şagirdyönümlü təlimin qiymətləndirilməsi ilə bağlı yeni bacarıq, bilik və anlayışlar əldə etməlidir.

Sübuta əsaslanan qiymətləndirmə kifayət qədər həqiqi, əsl, dəyişdirilə bilən və modul spesifikasiyalarının tələbləri ilə uyğun olan, keyfiyyət səviyyəsini müəyyən edən bacarıq sübutlarına əsaslanmalıdır.

Kifayət qədər bacarıq sübutu o deməkdir ki, təhsilalan təlim nəticələri və icra meyarlarında təsvir olunduğu kimi, tam açıqlama üzrə bütün fəaliyyətləri yerinə yetirə bildiyinə və təlim nəticəsinin tələb etdiyi bütün bilikləri mənimsədiyinə dair sübutlar təmin edir.

Həqiqi sübut nəzərdə tutulan qiymətləndirmə obyekti ilə birbaşa bağlı olan sübutdur. Əsl sübutlar fəaliyyəti qiymətləndirilən təhsilalan tərəfindən hazırlanmalıdır. Qiymətləndiricinin qiymətləndirmə və sertifikatlaşdırma sistemində maraqlı tərəflərin öz aralarında etibarını qazanmaq və qoruyub saxlamaq üçün sübutun həqiqiliyindən əmin olması çox vacibdir.

Qiymətləndirmə prosesi müvafiq icra sübutları hazırlayacaq təhsilalanın və dəstəkləyici olacaq, proses boyunca konstruktiv rəy verəcək qiymətləndiricinin fəal iştirakını əhatə edir.

Nailiyyət qazanılmasında qiymətləndirmə prosesinin ən mühüm aspektlərindən biri əks-əlaqənin verilməsidir. Vaxtında və güclü əks əlaqə təhsilalanlara təlim nəticələrini (nailiyyətləri) düzəltməyə və artırmağa kömək edə bilər.

Təlim prosesi boyunca toplanmış icra sübutları təhsilalanın nailiyyətləri haqqında qərar verməkdə qiymətləndirici üçün dəyərli mənbədir. Bununla belə, sübut müstəqil şəkildə qiymətləndirilməlidir. Yekun nəticə - səriştəlidir və ya səriştəli deyil, - qənaətinə gəlinməlidir.

Qiymətləndirmə vasitələrinin peşələr üzrə (seçmə yolla) təhlili qiymətləndirmə vasitələri zamanı nəzərə alınmalıdır.

Belə ki, şagird nailiyyətlərinin qiymətləndirilməsi müxtəlif vasitə və metodlardan istifadə etməklə aparıla bilər. Bir çox ekspertlər inanır ki, qiymətləndirmə metodlarından kompleks şəkildə istifadə olunması təhsilalanın nailiyyətlərinin obyektiv qiymətləndirilməsi üçün ən effektiv yoldur.

*Rəyçi: dos. Ə.Abbasov*

**İstifadə edilmiş ədəbiyyat**

1. " Təhsil haqqında" Azərbaycan Respublikasının Qanunu. Bakı, 2009.

2. Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı. Bakı: Çaşıoğlu, 1999.

3. Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu). Bakı, 2006.

4. "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası".// Azərbaycan məktəbi, 2013-cü il, № 5.

5. Azərbaycan Respublikasında texniki peşə təhsilinin inkişafı üzrə Dövlət Proqramı (2007-2012-ci illər). Bakı, 2007.

6. Abbasov Ə. Təhsil İslahatı və kurikulumların hazırlanması problemi. "Elmi əsərlər"i. Bakı, 2005.

7. Ağayev Ə. Yeni təlim metod və texnologiyalardan nəzəri və praktik məsələləri. ARTPİ-nin "Elmi əsərlər"i. Bakı: Qamma servis, 2005.

8. Mehdizadə M. Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları. Bakı: Maarif, 1982.

9. Mehrabov A. və Bəylərov E. Texnologiya və müasir təhsil. Bakı: Adiloğlu, 2003.

10. Рамазанов А., Аскеров Р. и др. Профессиональное образование и обучение на Южном Кафказе: на пути от выживания к эффективному функционированию национальных систем. Баку, 2008.

11. Əlizadə Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı: Pedaqogika, 2004.

12. Əhmədov A. Azərbaycan Respublikasının ümumtəhsil sistemində məzmun islahatları: perspektivlər və gözlənilən nəticələr. //ARTPİ-nin " Elmi əsərlər"i, Bakı, 2005.

13. Олейникова О., Муравьева Н. Аксенова обучение в течение всей жизни и профессиональное образование. Москва, 2011.

**Р.Аскеров,**
**М.Курбанов**

**Оценивание достижений учащихся на основе модульных программ (курикулумов) основанных на конпетенции**

**Резюме**

Данная статья посвящена одному из наиболее важных аспектов процесса обучения, в которых отражены оценка истинных и надежных компонентов. В статье, которая включает в себе оценку доказательств в полном объеме, рассматриваются такие вопросы как оценка производительности, решение по оценке, возможность повторной оценки, регистрация конечного результата.

В данной работе отражены оценка, наблюдение, устный или письменный запрос, а также формы практического обучения.

Руководящий документ "Руководство по оценке" позволит тренеру (учителю) по модулю оценить успеваемость учащихся.

**R.Asgarov,**
**M.Qurbanov**

**Evaluation of students achievement based on modular programs based on competences**

**Summary**

This article is devoted to one of the most important aspects of learning, which reflects the true and reliable components. The article, which includes the evaluation of the evidence in full, addresses such issues as performance assessment, a decision on the assessment, the possibility of re-evaluation, registration of the final result. This paper reflects the assessment, observation, oral or written request, as well as forms of practical training. Guidance document Guidance on the assessment will allow the module teacher to assess student achievement.

# ŞAGİRD FƏALİYYƏTİNİN ƏSAS MƏZMUN STANDARTININ QİYMƏTLƏNDİRİLMƏSİ BARƏDƏ

**Nəbi Mahmudov,**
***Bakı şəhəri 83 nömrəli məktəb-liseyin direktoru, fizika-riyaziyyat elmləri namizədi***

***Açar sözlər:*** *fəaliyyətin izlənilməsi, rubrik, siniflər üzrə rubrikin səviyyələri arasında əlaqə.*

***Ключевые слова:*** *прослеживание действий, рубрика, связь между уровнями рубрики по классам.*

**Key words:** *pursue of the activities, rubric, connection among levels of rubrics on classes.*

Millətin gələcəyini onun təhsilində görən Azərbaycan xalqının Ümummilli lideri Heydər Əliyevin 1999-cu ildə "Azərbaycan Respublikasının təhsil sahəsində İslahat Proqramı"nın qəbul edilməsi ilə bağlı imzaladığı Sərəncamla ölkəmizin təhsil sistemində islahatların aparılmasına start verildi. Bu məqsədlə ilkin olaraq Azərbaycan hökuməti ilə Dünya İnkişaf Assosiasiyası arasında Kredit sazişi imzalandı və müvafiq Fəaliyyət Planı hazırlandı. Sistemli şəkildə həyata keçirilən fəaliyyətlərin nəticəsi olaraq 2006-cı ildə Respublika Nazirlər Kabinetinin qərarı ilə "Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu)" təsdiq olundu. Bu Milli Kurikulum əsasında ibtidai təhsil səviyyəsinin I sinifləri üçün tərtib olunmuş nümunə dərsliklər Təhsil nazirinin əmri ilə 2007/2008-ci dərs ilində ölkənin seçilmiş ümumtəhsil məktəblərində eksperiment qaydasında tədris edildi. Aparılan eksperimentin nəticələri təhlil edilərək ümumiləşdirildi və növbəti tədris ilindən yeni dərsliklərin tətbiq olunması qərara alındı. Artıq 2008/2009-cu tədris ilindən respublikanın ümumtəhsil məktəblərinin I siniflərindən təlim prosesi yeni təhsil standartı və proqramları (kurikulumları) əsasında yazılmış yeni dərslik komplektlərindən – şagirdlər üçün dərsliklər və müəllimlər üçün metodik vəsaitlərdən istifadə olunmaqla həyata keçirilir. Yeni dərslik komplektlərinin tətbiq edilməsi bu siniflərdə şagirdlərin dərs (cari, gündəlik) fəaliyyətinin və tədris vahidləri (bölmələr, fəsillər) üzrə nailiyyət səviyyəsinin qiymətləndirilməsi üçün yeni normativ hüquqi sənədlərin hazırlanmasını zəruri etdi. "Azərbaycan Respublikasının ümumi təhsil sistemində qiymətləndirmə Konsepsiyası" hazırlandı və hökumət tərəfindən qəbul olundu. Hazırda yeni fənn kurikulumları istifadə edilən siniflərdə şagirdlərin bacarıq və nailiyyət səviyyəsinin qiymətləndirilməsi "Ümumi təhsil məktəblərində məktəbdaxili qiymətləndirmənin aparılması üçün müvəqqəti Təlimat" əsasında həyata keçirilir (5). Bu siniflərdə şagirdlərin gündəlik qiymətləndirilmə şəklində deyil, fəaliyyətin sözlə qiymətləndirilməsi şəklində, sözlə qiymət-

ləndirmə isə şagirdin fəaliyyətinin müəllim tərəfindən müvafiq məzmun standartına uyğun olaraq təyin olunmuş təlim məqsədləri əsasında aspektlər üzrə izlənilməsi – dərsdə əldə etdiyi biliyin bacarığa çevrilmə səviyyəsinin müəyyən edilməsi şəklində aparılır. Bunun üçün müəllim tərəfindən dörd səviyyəli (I-IV səviyyələrdə) rubriklər hazırlanır. Burada I səviyyə şagirdin nail olacağı biliyin bacarığa çevrilməsinin ən aşağı, IV səviyyə isə onun ən yüksək səviyyəsini təyin edir. Aralıq səviyyələr adlanan II-III səviyyələr isə I və IV səviyyələrə əsasən müəyyən olunur. Bu zaman şagirdin II (III, IV) səviyyə üzrə bacarıq səviyyəsinin onun I səviyyəyə aid bacarıq səviyyəsindən iki (üç, dörd) dəfə üstün olduğu qəbul edilir. Analoji olaraq II (III, IV) səviyyəyə aid qiymətləndirmə tapşırığının I səviyyəyə aid qiymətləndirmə tapşırığından iki (üç, dörd) dəfə çətin olduğu nəzərə alınır.

Biz şagirdin dərsdə fəaliyyətinin eyni əsas məzmun standartının ardıcıl siniflər üzrə alt standartları əsasında izlənilməsi və bacarıq səviyyəsinin qiymətləndirilməsi üçün tərtib edilən rubriklərin səviyyələri arasında əlaqəni təyin edəcəyik. Bu məqsədlə əvvəlcə "I. Ədədlər və əməllər" məzmun xəttinin I-IX siniflər üzrə 1.1 əsas və onların müvafiq alt məzmun standartlarını nəzərdən keçirək: [3, s. 80, 84, 88, 92, 97, 101, 105, 109, 113].

Qəbul edilmiş sənədlər əsasında tərtib edilmiş aşağıdakı cədvəldən ümumi orta təhsil səviyyəsində riyaziyyat fənninin "I. Ədədlər və əməllər" məzmun xəttinə aid

| **Məzmun xətti: I. Ədədlər və əməllər** | | |
|---|---|---|
| **I-IX siniflər üzrə məzmun xəttinə aid əsas və alt məzmun standartları:** | | |
| **Sinif** | **Əsas məzmun standartı** | **Alt məzmun standartı** |
| **I** | 1.1 – şagird say və ədəd anlayışlarını, onlar arasındakı əlaqəni başa düşdüyünü nümayiş etdirir. | 1.1.3 – şagird 20 dairəsində ədədləri oxuyur və yazır |
| **II** | 1.1 – şagird ədəd anlayışını, ədədin strukturunu, ədədlər arasındakı münasibətləri başa düşdüyünü nümayiş etdirir. | 1.1.1 – şagird 100 dairəsində ədədləri oxuyur və yazır. |
| **III** | 1.1 – şagird ədəd anlayışını, ədədin strukturunu, ədədlər arasındakı münasibətləri başa düşdüyünü nümayiş etdirir. | 1.1.1 – şagird 1000 dairəsində ədədləri oxuyur və yazır. |
| **IV** | 1.1 – şagird ədəd anlayışını, ədədin strukturunu, ədədlər arasındakı münasibətləri başa düşdüyünü və sadə kəsrləri tanıdığını nümayiş etdirir. | 1.1.1 – şagird 1000000 dairəsində ədədləri oxuyur və yazır. |
| **V** | 1.1 – şagird ədədləri, onların müxtəlif formada verilməsini bilir və aralarındakı münasibətləri müəyyənləşdirir. | 1.1.1 – şagird natural ədədləri oxuyur və yazır. |
| **VI** | 1.1 – şagird ədədləri, ədədlərin müxtəlif formada verilməsini, onların arasındakı münasibətləri tətbiq edir. | 1 .1.1 – şagird tam ədədləri oxuyur və yazır. |
| **VII** | 1.1 – şagird ədədləri, ədədlərin müxtəlif formada verilməsini, onların arasındakı münasibətləri tətbiq edir. | 1.1.1 – şagird rasional ədədləri oxuyur və yazır. |
| **VIII** | 1.1 – şagird ədədləri, ədədlərin müxtəlif formada verilməsini, onların arasındakı münasibətləri tətbiq edir. | 1.1.1 – şagird irrasional (kvadrat kökalma ilə təyin olunan) ədədləri oxuyur və yazır. |
| **IX** | 1.1 – şagird ədədləri, ədədlərin müxtəlif formada verilməsini, onların arasındakı münasibətləri tətbiq edir. | 1.1.1 – şagird həqiqi ədədləri oxuyur və yazır. |

əsas məzmun standartlarının, demək olar ki, eyni məzmunda tərtib olunduqları, sabit qaldıqları, lakin onların müvafiq alt məzmun standartlarının siniflər (və ya səviyyələr) üzrə "qismən" dəyişdiyi, başqa sözlə, ikinci sinifdən başlayaraq hər bir alt məzmun standartının özündən əvvəlki üzərində qurulduğu və onu inkişaf etdirdiyi – üfüqi istiqamətdə genişləndiyi, şaquli istiqamətdə dərinləşdiyi görünür. Daha dəqiq desək, şagird birinci sinifdə 20 dairəsində ədədlərlə tanış olduğu, onları onluq və təkliklərə ayırmaqla yazmağı və oxumağı nümayiş etdirmək bacarıqlarına yiyələndiyi halda, ikinci sinifdə bu proses 100, üçüncü siniflərdə 1000, dördüncü sinifdə isə 1000000 dairəsində həyata keçirilir. V sinifdən ədəd anlayışının sistemli şəkildə öyrədilməsinə başlanılır: şagirdlər V sinifdə natural, VI sinifdə tam, VII sinifdə rasional, VIII sinifdə irrasional, IX sinifdə həqiqi ədədləri öyrənirlər. Bu zaman təlim prosesi asandan çətinə, sadədən mürəkkəbə didaktik prinsipinə əməl olunmaqla qurulur. Şagird ardıcıl tədris illərində (nəticədə) ədəd anlayışının genişləndirilməsi ilə yaxından tanış olur, onların mərtəbələrə (təkliklərə, onluqlara, yüzlüklərə) və siniflərə ayrılmasını öyrənir, yazılmasını, oxunmasını və aralarındakı qarşılıqlı əlaqələri mənimsəyir.

Aşağıda şagirdin eyni məzmun xəttinə aid əsas məzmun standartının müxtəlif siniflər üzrə eyni məzmunlu alt məzmun standartları əsasında fəaliyyətinin izlənilməsi (bacarıq səviyyəsinin qiymətləndirilməsi) üçün tərtib olunmuş rubrik nümunələri verilir və onların səviyyələri arasında əlaqənin yaradılması təklif olunur:

**Məzmun xətti: I. Ədədlər və əməllər.**

**I** sinif üzrə: **a)** əsas məzmun standartı: 1.1; **b)** alt məzmun standartı: 1.1.3.

Məzmun standartı üzrə təlim məqsədi: 1.1.3 – şagird 20 dairəsində ədədləri oxumağı və yazmağı nümayiş etdirir.

Qiymətləndirmə aspekti: təqdimetmə

I sinifdə təhsilalanın 1.1.3 alt məzmun standartı üzrə müəyyən olunmuş təlim məqsədi əsasında təyin edilən qiymətləndirmə aspekti üzrə fəaliyyətinin qiymətləndirilməsi üçün rubrik:

| | |
|---|---|
| **I səviyyə** | Müəllimin köməyi ilə 20 dairəsində verilmiş ədədi əyani vəsait və təsvirlərdən istifadə etməklə bir onluq və təkliklərə ayırır və oxuyur. |
| **II səviyyə** | 20 dairəsində verilən ədədi müxtəlif əyani vəsaitlərin köməyi ilə bir onluq və təkliklərə ayırır, oxuyur və yazır. |
| **III səviyyə** | 20 dairəsində rəqəmlərlə və sözlərlə verilmiş ədədləri onluq və təkliklərə ayırmağı, oxumağı, yazmağı və müəyyən situasiyalarda istifadə etməyi nümayiş etdirir. |
| **IV səviyyə** | 20 dairəsində ədədləri onluq və təkliklərə ayırmağı (və əksinə), oxumağı, yazmağı, onlardan müxtəlif situasiyalarda istifadə etməyi nümayiş etdirir və şərh verir. |

**II** sinif üzrə: **a)** əsas məzmun standartı: 1.1; **b)** alt məzmun standartı: 1.1.1.

Məzmun standartı üzrə təlim məqsədi: 1.1.1 – şagird 100 dairəsində ədədləri oxumağı və yazmağı nümayiş etdirir.

Qiymətləndirmə aspekti: nümayişetmə

II sinifdə təhsilalanın 1.1.1 alt məzmun standartı üzrə müəyyən olunmuş təlim məqsədi əsasında təyin edilən qiymətləndirmə aspekti üzrə fəaliyyətinin qiymətləndirilməsi üçün rubrik:

| | |
|---|---|
| **I səviyyə** | 20 dairəsində ədədləri onluq və təkliklərə ayırır, oxuyur və yazır. Müəllimin köməyi ilə 100 dairəsində verilən ədədi onluq və təkliklərə ayırır, oxuyur və yazır. |
| **II səviyyə** | 100 dairəsində verilən ədədi onluq və təkliklərə ayırır, oxuyur və yazır. |
| **III səviyyə** | 100 dairəsində ədədi onluq və təkliklərlə ifadə etməyi, oxumağı, yazmağı və lazımi situasiyalarda istifadə etməyi nümayiş etdirir. |
| **IV səviyyə** | 100 dairəsində ədədləri onluq və təkliklərlə ifadə etməyi, oxumağı, yazmağı, müxtəlif situasiyalarda məqsədəuyğun istifadə etməyi nümayiş etdirir və izahat verir. |

**III** sinif üzrə: **a)** əsas məzmun standartı: 1.1; **b)** alt məzmun standartı: 1.1.1.

Məzmun standartı üzrə təlim məqsədi: 1.1.1 – şagird 1000 dairəsində ədədləri oxumağı və yazmağı nümayiş etdirir.

Qiymətləndirmə aspekti: nümayişetmə

III sinifdə təhsilalanın 1.1.1 alt məzmun standartı üzrə müəyyən olunmuş təlim məqsədi əsasında təyin edilən qiymətləndirmə aspekti üzrə fəaliyyətinin qiymətləndirilməsi üçün rubrik:

| | |
|---|---|
| **I səviyyə** | 100 dairəsində verilən ədədləri onluq və təkliklərə ayırır, oxuyur və yazır. Müəllimin köməyi ilə 1000 dairəsində verilən ədədi mərtəbələrə ayırır, oxuyur və yazır. |
| **II səviyyə** | 1000 dairəsində verilən ədədi mərtəbələrə ayırır, oxuyur və yazır. |
| **III səviyyə** | 1000 dairəsində ədədi mərtəbələrə ayırmağı, oxumağı, yazmağı və müəyyən situasiyalarda istifadə etməyi nümayiş etdirir. |
| **IV səviyyə** | 1000 dairəsində ədədləri mərtəbələrə ayırmağı, oxumağı, yazmağı, müxtəlif situasiyalarda istifadə etməyi nümunələr əsasında nümayiş etdirir və izahat verir. |

**IV** sinif üzrə: **a)** əsas məzmun standartı: 1.1; **b)** alt məzmun standartı: 1.1.1.

Məzmun standartı üzrə təlim məqsədi: 1.1.1 – şagird 1000000 dairəsində ədədləri oxumağı və yazmağı nümayiş etdirir.

Qiymətləndirmə aspekti: nümayişetmə

IV sinifdə təhsilalanın 1.1.1 alt məzmun standartı üzrə müəyyən olunmuş təlim məqsədi əsasında təyin edilən qiymətləndirmə aspekti üzrə fəaliyyətinin qiymətləndirilməsi üçün rubrik:

| | |
|---|---|
| **I səviyyə** | 1000 dairəsində ədədləri mərtəbələrə ayırır, oxuyur və yazır. Müəllimin köməyi ilə 1000000 dairəsində verilən ədədi siniflərə ayırır, oxuyur və yazır. |
| **II səviyyə** | 1000000 dairəsində verilən ədədi siniflərə ayırır, oxuyur və yazır. |
| **III səviyyə** | 1000000 dairəsində ədədi siniflərə ayırmağı, oxumağı və yazmağı nümunə əsasında nümayiş etdirir. |
| **IV səviyyə** | 1000000 dairəsində ədədləri siniflərə ayırmağı, oxumağı və yazmağı müxtəlif situasiyalarda nümayiş etdirir, zəruri izah verir. |

**V** sinif üzrə: **a)** əsas məzmun standartı: 1.1; **b)** alt məzmun standartı: 1.1.1.

Məzmun standartı üzrə təlim məqsədi: 1.1.1 – şagird natural ədədləri oxumağı və yazmağı nümayiş etdirir.

Qiymətləndirmə aspekti: nümayişetmə

V sinifdə təhsilalanın 1.1.1 alt məzmun standartı üzrə müəyyən olunmuş təlim məqsədi əsasında təyin edilən qiymətləndirmə aspekti üzrə fəaliyyətinin qiymətləndirilməsi üçün rubrik:

| | |
|---|---|
| **I səviyyə** | 1000000 dairəsində ədədləri siniflərə ayırır, oxuyur və yazır. Müəllimin köməyi ilə natural ədədin tərifini söyləyir, rəqəmlərlə verilən natural ədədi siniflərə ayırır, oxuyur və yazır. |
| **II səviyyə** | Rəqəmlərlə verilən natural ədədi siniflərə ayırır, oxuyur, yazır, sözlərlə verilmiş natural ədədi müəllimin köməyi ilə rəqəmlərlə yazır. |
| **III səviyyə** | Rəqəmlərlə və sözlərlə verilən natural ədədi siniflərə ayırmaqla oxumağı və yazmağı nümayiş etdirir. |
| **IV səviyyə** | Rəqəmlərlə və sözlərlə verilən natural ədədləri siniflərə ayırmağı, oxumağı, yazmağı və müxtəlif situasiyalarda onlardan istifadəni nümunələr əsasında nümayiş etdirir və izahat verir. |

**VI** sinif üzrə: **a)** əsas məzmun standartı: 1.1; **b)** alt məzmun standartı: 1.1.1.

Məzmun standartı üzrə təlim məqsədi: 1.1.1 – şagird tam ədədləri oxumağı və yazmağı nümayiş etdirir.

Qiymətləndirmə aspekti: nümayişetmə

VI sinifdə təhsilalanın 1.1.1 alt məzmun standartı üzrə müəyyən olunmuş təlim-

məqsədi əsasında təyin edilən qiymətləndirmə aspekti üzrə fəaliyyətinin qiymətləndirilməsi üçün rubrik:

| | |
|---|---|
| **I səviyyə** | Natural ədədlərin tərifini söyləyir, onları siniflərə ayırır, oxuyur və yazır. Müəllimin köməyi ilə tam ədədlər çoxluğunun tərifini söyləyir, verilən tam ədədi oxuyur. |
| **II səviyyə** | Verilən tam ədədi oxuyur, sözlərlə verilən tam ədədi müəllimin köməyi ilə rəqəmlərlə yazır. |
| **III səviyyə** | Rəqəmlərlə və sözlərlə verilən istənilən tam ədədi oxumağı və yazmağı nümayiş etdirir. |
| **IV səviyyə** | Rəqəmlərlə və sözlərlə verilən tam ədədlərin siniflərə ayrılmasını, oxunmasını və yazılmasını müxtəlif nümunələr əsasında şərh edir. |

**VII** sinif üzrə: **a)** əsas məzmun standartı: 1.1; **b)** alt məzmun standartı: 1.1.1.

Məzmun standartı üzrə təlim məqsədi: 1.1.1 – şagird rasional ədədləri oxumağı və yazmağı nümayiş etdirir.

Qiymətləndirmə aspekti: nümayişetmə

VII sinifdə təhsilalanın 1.1.1 alt məzmun standartı üzrə müəyyən olunmuş təlim məqsədi əsasında təyin edilən qiymətləndirmə aspekti üzrə fəaliyyətinin qiymətləndirilməsi üçün rubrik:

| | |
|---|---|
| **I səviyyə** | Tam ədədlərin tərifini söyləyir, onları oxuyur və yazır. Müəllimin köməyi ilə rasional ədədin tərifini söyləyir və verilən rasional ədədi oxuyur. |
| **II səviyyə** | Verilən rasional ədədi oxuyur, sözlərlə verilmiş rasional ədədi müəllimin köməyi ilə rəqəmlərlə yazır. |
| **III səviyyə** | Rəqəmlərlə və sözlərlə verilən rasional ədədi oxumağı və yazmağı nümunə əsasında nümayiş etdirir. |
| **IV səviyyə** | Rəqəmlərlə və sözlərlə verilən rasional ədədlərin oxunmasını və yazılmasını müxtəlif nümunələr əsasında şərh edir. |

**VIII** sinif üzrə: **a)** əsas məzmun standartı: 1.1; **b)** alt məzmun standartı: 1.1.1.

Məzmun standartı üzrə təlim məqsədi: 1.1.1 – şagird irrasional (kvadrat kökalma ilə təyin olunan) ədədləri oxumağı və yazmağı nümayiş etdirir.

Qiymətləndirmə aspekti: nümayişetmə

VIII sinifdə təhsilalanın 1.1.1 alt məzmun standartı üzrə müəyyən olunmuş təlim məqsədi əsasında təyin edilən qiymətləndirmə aspekti üzrə fəaliyyətinin qiymətləndirilməsi üçün rubrik:

| | |
|---|---|
| **I səviyyə** | Rasional ədədlərin tərifini söyləyir, onları oxuyur, yazır Müəllimin köməyi ilə verilən irrasional (kvadrat kökalma ilə təyin olunan) ədədi oxuyur. |
| **II səviyyə** | Verilən irrasional ədədi oxuyur, sözlərlə verilən irrasional (kvadrat kökalma ilə təyin olunan) ədədi müəllimin köməyi ilə rəqəmlərlə yazır. |
| **III səviyyə** | Rəqəmlərlə və sözlərlə verilən istənilən irrasional (kvadrat kökalma ilə təyin olunan) ədədi oxumağı və yazmağı nümayiş etdirir. |
| **IV səviyyə** | İrrasional (kvadrat kökalma ilə təyin olunan) ədədlərin oxunmasını və yazılmasını müxtəlif nümunələr əsasında şərh edir. |

**IX** sinif üzrə: **a)** əsas məzmun standartı: 1.1; **b)** alt məzmun standartı: 1.1.1.

Məzmun standartı üzrə təlim məqsədi: 1.1.1 – şagird həqiqi ədədləri oxumağı və yazmağı nümayiş etdirir.

Qiymətləndirmə aspekti: nümayişetmə

IX sinifdə təhsilalanın 1.1.1 alt məzmun standartı üzrə müəyyən olunmuş təlim məqsədi əsasında təyin edilən qiymətləndirmə aspekti üzrə fəaliyyətinin qiymətləndirilməsi üçün rubrik:

| | |
|---|---|
| **I səviyyə** | İrrasional ədədin tərifini söyləyir, kvadrat kökalma ilə təyin olunan ədədi oxuyur və yazır. Müəllimin köməyi ilə verilən həqiqi ədədi oxuyur. |
| **II səviyyə** | Rəqəmlərlə verilən həqiqi ədədi oxumağı, sözlərlə verilən həqiqi ədədi isə müəllimin köməyi ilə rəqəmlərlə yazır. |
| **III səviyyə** | Rəqəmlərlə və sözlərlə verilmiş həqiqi ədədi oxumağı və yazmağı nümayiş etdirir. |
| **IV səviyyə** | Rəqəmlərlə və sözlərlə verilmiş həqiqi ədədlərin oxunmasını və yazılmasını müxtəlif nümunələr əsasında şərh edir. |

Yeni təhsil standartı və proqramları (kurikulumları) tətbiq olunan siniflərdə aparılan müşahidə və təhlillər nəticəsində müəllimlərin əksər hissəsinin riyaziyyatdan 1.1 əsas məzmun standartının 1.1.1 alt məzmun standartları üzrə təlim məqsədlərinə uyğun qiymətləndirmə aspekti əsasında müxtəlif siniflər üzrə rubriklər hazırladıqları zaman siniflər (səviyyələr)arası əlaqəni nəzərə almadıqları, onu inkişaf etdirmədikləri aydın olmuşdur.

Biz şagirdin eyni məzmun xəttinə aid əsas məzmun standartının müxtəlif siniflərə aid müvafiq alt məzmun standartları üzrə fəaliyyətinin qiymətləndirilməsi üçün rubriklərin əsas məzmun standartı → I (II, III, ..., X) sinif üzrə alt məzmun standartı → təlim məqsədi → qiymətləndirmə aspekti → qiymətlədirmə səviyyələri (rubrik) → II (III, IV, ..., XI) sinfə aid alt məzmun standartı → təlim məqsədi → qiymətləndirmə aspekti → qiymətləndirmə səviyyələri (rubrik, bu halda əvvəlki sinfin səviyyəsi nəzərə alınır) → ... alqoritmi əsasında hazırlanmasını və onların siniflər üzrə səviyyələri arasında əlaqənin aşağıdakı cədvəl əsasında qurulmasını təklif edirik:

| **Sinif** | **Səviyyələr** | | | | | | | | | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| I | I | II | III | IV | | | | | | | | | | | | | | | | |
| II | | | | I | II | III | IV | | | | | | | | | | | | | |
| III | | | | | | | I | II | III | IV | | | | | | | | | | |
| IV | | | | | | | | | | I | II | III | IV | | | | | | | |
| V | | | | | | | | | | | | | I | II | III | IV | | | | |
| VI | | | | | | | | | | | | | | | | I | II | III | IV | |
| ... | | | | | | | | | | | | | | | | | | | I | II |

Göründüyü kimi, “I. Ədədlər və əməllər” məzmun xəttinin 1.1 əsas məzmun standartının I-IX siniflər üzrə eyni alt məzmun standartlarını nəzərdən keçirdikdə ikinci sinifdən başlayaraq hər sonrakı sinifdə reallaşdırılan alt məzmun standartının özündən əvvəlki sinifdə reallaşdırılmış məzmun standartının horizontal və vertikal davamı olduğu aydın olur. Bu baxımdan ardıcıl siniflər üzrə şagirdin fəaliyyətinin alt məzmun standartları üzrə qiymətləndirilməsi üçün tərtib olunan rubriklərin səviyyələrinin ikinci sinifdən başlayaraq hər sonrakı sinifdə təhsilalanın bacarıq səviyyəsinin onun əvvəlki sinifdə nail olmalı olduğu bacarıq səviyyəsinin nəzərə alınmaqla tərtib olunmasını məqsədəuyğun hesab edirik. Biz göstərilənləri nəzərə alaraq, şagirdin II (III-XI) sinfə aid I səviyyə üzrə bacarıq səviyyəsinin onun I (II-X) sinifdə nail olmalı olduğu ən yüksək (IV) bacarıq səviyyəsi ilə eyni olmasını təklif edirik (bununla belə, ikinci sinifdən başlamaqla, müəllim sinifdə təhsil alan şagirdlərin ümumi bilik və bacarıq səviyyəsindən asılı olaraq sonrakı sinifdə şagirdin I səviyyə üzrə bacarıq səviyyəsini onun əvvəlki sinifdə nail olmalı olduğu III (və ya II) bacarıq səviyyəsini də qəbul edə bilər). Bu, həqiqətən belə də olmalıdır. Ona görə ki, riyaziyyatın tədrisində horizontal və vertikal əlaqə nəzərə alınır və hər sonrakı (məsələn, ikinci) sinifdə öyrənilənlər əvvəlki (birinci) sinifdə öyrənilənlərin horizontal və vertikal davamı kimi verilir. Biz təlim prosesində şagirdin qiymətləndirilən bacarıqlarının səviyyələrinin düzgün müəyyən olunmasını təhsilin keyfiyyətinin yüksəldilməsinə ciddi təsir edən mühüm amil hesab edirik.

Qeyd edək ki, bu məsələ ibtidai təhsil səviyyəsində çox sadə şəkildə öz həllini tapdığı halda, bəzən ümumi orta və tam orta təhsil səviyyələrində müəyyən çətinliklərlə qarşılaşmalı oluruq. Belə ki, müəyyən mənada ibtidai təhsil səviyyəsində şagirdləri birinci sinifdə qəbul edən müəllim onlarla dörd il ardıcıl təmasda olduğu üçün (onlara nəyi hansı səviyyədə öyrətdiyini və onların hansı sinifdə hansı səviyyədə bilik əldə etdiklərini, hansı səviyyədə bacarıqlara yiyələndiyini bildiyi üçün) hər növbəti dərs ilində onların fəaliyyətini izləyərkən əvvəlki sinifdə bacarıq səviyyələrini nəzərə alır, yeni (sonrakı) sinifdə onu düzgün müəyyən edə bilir. Bu baxımdan ümumi və tam orta təhsil səviyyələrində dərs aparan fənn müəllimlərinin şagirdlərin əvvəlki təhsil səviyyələrində və ya siniflərdə hansı məz-

mun xətti üzrə hansı bilik və bacarıqlara nail olmalı olduğunu bildirən əsas məzmun standartlarının müvafiq alt standartları üzrə nail olmalı olduqları bilik və bacarıq səviyyələri barədə məlumatlı olmalarını zəruri hesab edirik.

Məqalənin aktuallığı. Məqalə ümumi təhsil məktəblərinin yeni təhsil standartı və proqramları (kurikulumları) tətbiq olunan siniflərində riyaziyyatdan şagirdin fəaliyyətinin əsas məzmun standartının müvafiq alt standartları (ardıcıl siniflər) üzrə izlənilməsi və bacarıq səviyyəsinin qiymətləndirilməsi üçün rubriklərin hazırlanması zamanı fənn üzrə horizontal və vertikal əlaqənin nəzərə alınmasına həsr edilmişdir.

Məqalənin elmi yeniliyi. Məqalədə ilk dəfə olaraq riyaziyyatdan şagirdin fəaliyyətinin izlənilməsi üçün rubrik tərtib edərkən əsas məzmun standartının əvvəlki sinif(lər)də reallaşdırılmış müvafiq alt məzmun standart(lar)ı üzrə bacarıq səviyyələrinin nəzərə alınması üçün model təklif olunur.

*Rəyçi: dos. İ.Cavadov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Ümumtəhsil məktəblərinin I-IV sinifləri üçün fənn kurikulumları. Bakı, 2008.

2. Azərbaycan Respublikasının ümumi təhsil sistemində Qiymətləndirmə Konsepsiyası. Bakı, 2009.

3. Ümumi təhsilin fənn standartları (I-XI siniflər). Bakı, 2012.

4. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası.// Azərbaycan məktəbi, 2013, № 5.

5. Ümumi təhsil məktəblərində məktəbdaxili qiymətləndirmənin aparılmasına dair müvəqqəti Təlimat. Bakı, 2013.

6. Шакиров Р., Кадыралиева М., Сахарова Г., Буркитова А. Формативное оценивание на уроках математики. Практическое пособие для учителя. Бишкек: Билим, 2012.

**Н.Махмудов**

**Об оценивании деятельности учащегося по стандартам основного содержания**

**Резюме**

В этой статье впервые предлагается новый подход к подготовке (разработке) уровней способности для оценивания деятельности учащегося на основе подстандартов одного и того же стандарта содержания по классам. В таком случае рекомендуется принимать во внимание уровни способностей относительно подстандартам основного стандарта предыдущих классов. В статье также приведены примеры.

**N.Mahmudov**

**About the assessment of student`s activity according the main contest standards**

**Summary**

It is the first article that suggests the new approach to preparing skill levels for assessment of pupil’s activity in grades according the same main content standard and substandards. Therefore it is recommended to take into account the skill levels on appropriate substandards according the main content standard of previous grades. There are also given some samples in the article.

# DƏRSƏ MARAĞIN YARADILMASINDA İNNOVATİV METODLARDAN İSTİFADƏ

**Şirin Mahmudova,**
***Qax şəhər E.Babayev adına 4 nömrəli tam orta məktəbin müəllimi***

***Açar sözlər:*** *dərs, kurikulum, innovasiya, müəllim, şagird.*
***Ключевые слова:*** *урок, курикулум, инновация, учитель, ученик.*
***Key words:*** *lesson, curiculum, innovative, teacher, student.*

Respublikamızın təhsil sisteminin dünya təhsil sisteminə inteqrasiya edilməsi çox mühüm islahatlar aparılmasını zəruri etmişdir. "Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu)" sənədi istər təhsilin məzmununda, istərsə də təşkilində, eləcə də həyata keçirilməsində yeni yanaşmalar və şagirdlərdə yeni təfəkkür tərzi formalaşdırmağı tələb edir.

Bu məqsədlə respublikamızda ilk dəfə olaraq şəxsiyyətyönümlü, şagirdyönümlü, nəticəyönümlü səciyyəsi ilə seçilən kurikulumlar, o cümlədən kimya fənni üzrə orijinal kurikulum hazırlanmışdır. Kimya insan həyatının bütün sahələrinə nüfuz edən bir elmdir. Kurikulumda bu mühüm amil nəzərə alınaraq, kimyanın tədrisi zamanı şagirdlərə bu elmə maraq, riyazi hesablamalar, yeni texniki vəsaitlərdən istifadə etmək, təbiətdə baş verən hadisələri, maddi aləmdə gedən dəyişiklikləri dərk etmək, həyatda, məişətdə ekoloji problemlərin həllində iştirak etmək bacarığı aşılanmalıdır.

Kimya fənn kurikulumunda fənnin məzmunu və vəzifələri ilə yanaşı, zəruri olan təlim strategiyaları, innovativ metodlar və üsullar müəyyənləşdirilmişdir.

Kurikulumun qarşıya qoyduğu məqsəd və vəzifələr hər hansı bir şagirdin kimya fənni üzrə əldə etdiyi bilik və bacarıqlarla əlaqələndirilməsini nəzərdə tutur, təlim prosesində inteqrativlik ön plana çəkilir. Fənlərarası inteqrasiya qazanılan biliyin müxtəlif fənlər vasitəsilə daha da təkmilləşdirilməsini təmin edir. Şagirdlərdə səmərəli ünsiyyət, fərqli yanaşma, problemin həlli və s. kimi bacarıqlar formalaşır, ənənəvi metodlardan fərqli olaraq onların daha çox inkişafına və dərketməsinə kömək edir. Kimya fənninin inteqrasiya imkanları daha geniş olduğundan bir çox mövzular inteqrativ dərslərin mövzusu ola bilər. Məsələn, IX sinifdə "Metallar" mövzusunu tədris edərkən Azərbaycanın dahi şairi, görkəmli mütəfəkkir və filosof Nizami Gəncəvi yaradıcılığına müraciət edərək, onun "Xosrov və Şirin" poemasındakı dəmirin maqnit xassəsindən bəhs edən misralarını nümunə göstərmək olar:

Eşq düşsə daşın da qəlbinə əgər
Gövhərdən özünə məşuq düzəldər.
Maqnit olmasaydı eşqin əsiri,
Çəkməzdi özünə dəmir zənciri.

Bu misralardan göründüyü kimi, öz dövründə məlum kimyəvi elementlər və

onlardan alınan məmulatların, habelə qiymətli maddələrin xassələrini və tətbiqini gözəl bilən Nizami dəmirin maqnit hadisəsindən də xəbərdar imiş. XI sinifdə kimyadan "Zülallar, onların quruluşu, xassələri və funksiyaları" mövzusunu biologiya fənnindən zülallar haqqındakı mövzu ilə əlaqəli inteqrativ dərs şəklində qurmaq olar. Zülalların əmələ gəlməsini izah edərkən qeyd etmək olar ki, həzm üzvlərindən qana keçən amin turşuları hüceyrələrdə olan nuklein turşuları vasitəsilə bir-birinə birləşərək orqanizmə lazım olan zülalları əmələ gətirir.

VIII sinifdə "Su" mövzusunu tədris edərkən dərsi bir sıra fiziki anlayışlarla əlaqələndirmək mümkündür. Su yeganə maddədir ki, yaşadığımız Yer mühitində biz eyni vaxtda onun təbii olaraq üç halını: buz (bərk), su (maye), buxar (qaz) hallarını görə bilirik. Suyun bir varlıq kimi belə öyrənilməsi, fizikada tədris olunan maddələrin aqreqat halları haqqındakı biliklərlə daha da möhkəmləndirilir. Sudan qızdırıcı və ya soyuducu maddə kimi istifadə edilməsi və onun elmi izahı, fizika fənnində öyrədilən qaynama, buxarlanma, kondensasiya, istilikvermə, istilik tutumu, istilik miqdarı və s. kimi fiziki anlayışlarla izah edilə bilər. Gələcəyimiz olan gənclərin hərbi xidmətə və vətənin müdafiəsinə hazırlanması da xüsusi diqqət tələb edən məsələlərdəndir. Bu məqsədlə kimya fənni, GÇH fənni ilə biliklərinin kompleks öyrənilməsi mühüm əhəmiyyət kəsb edir. IX sinifdə "Hallogenlər" mövzusunun tədrisində xlor qazının orqanizmə göstərdiyi mənfi təsirlərdən və bununla zəhərlənmənin ağır nəticələrindən danışaraq, bundan mühafizə olunmaq üçün natrium-tiosulfat məhlulu hopdurulmuş süzgəcdən istifadənin müsbət təsirini qeyd etmək lazımdır. Bu zaman başqa qazla da zəhərlənmə mümkündür. Bu qaz HCI qazıdır, bunu isə çay sodası ilə zərərsizləşdirmək olar.

Yuxarıda göstərilən nümunələr deməyə əsas verir ki, dərslərin bu formada təşkili şagirdlərin mövzuları daha yaxşı mənimsəməsinə, bacarıqlarının formalaşmasına müsbət təsir göstərəcək, əsas məqsədimiz olan kurikulum islahatı çərçivəsində aparılan təhsilin gələcək nəslin həyata hazırlanması istiqamətində əhəmiyyətli rolu olacaqdır. İnteqrativ kurikulum imkan verir ki, biz müəllimlər təhsilə ayrı-ayrı fənlərin öyrədilməsi kimi deyil, XXI əsrin tələb etdiyi həyati bacarıqların inkişaf etdirilməsi prosesi kimi baxaq, şagirdlərimizi həyatı boyu öyrənməyə sövq edək.

*Rəyçi: dos. İ.Cavadov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Əlizadə Ə. Şagird aləminin "dünyaya açılan mənzərəsi".//Azərbaycan məktəbi, 2014, №5.

2.Veysova Z. Fəal (interaktiv) təlim. Müəllimlər üçün vəsait. UNİCEF, 2007.

3. Kərimov F. və b. İnteqrativ kurikulum: mahiyyət və nümunələr. Bakı, 2005.

**Ш.Махмудова**

**Использование инновативных методов в создании интереса к уроку**

**Резюме**

В статье говорится о возможностях курикулума в обучении предметов с использованием интеграции. В связи с этим автор обращается к некоторым темам по химии.

**SH. Mahmudova**

**The using innovative methods in creating interest to teaching**

**Summary**

In the article it is spoken about teaching different subjects through integrated curriculum opportunities. Some examples are given from Chemistry as a sample.

***Məktəb tariximizdən***



# ƏNƏNƏLƏRLƏ YAŞAYAN MƏKTƏB

**İmran Sabirov,**
***A.O.Çernyayevski adına Qobustan şəhər 1 nömrəli tam orta məktəbin direktoru, əməkdar müəllim***

***Açar sözlər:*** *ibtidai xalq məktəbləri, “Vətən dili” dərsliyi, Zaqafqaziya Müəllimlər Seminariyası, xalq maarifi, “Ana dili” dərsliyi.*

***Ключевые слова:*** *начальные народные школы, учебник “Vətən dili”, Семинария Закавказских Учителей, народное просвещение, учебник “Родная Речь”.*

***Key words:*** *elementary public schools, "Native Language" textbook, Transcaucasia Teachers' Seminary, public education, "Mother Tongue" textbook.*

Azərbaycan məktəb tarixinin şərəfli keçmişi vardır. XIX əsrin sonu, XX əsrin əvvəllərində bütün dünyada maddi-mənəvi mədəniyyətlərin inkişafı Azərbaycan xalqının da tarixinə töhfələr vermişdir. Azərbaycanın qabaqcıl ziyalıları da bu dövrdə müxtəlif təhsil ocaqları yaratmış, xalqın savadlanması üçün bir sıra dəyərli işlər görmüşlər. Bu baxımdan, Qobustan rayonundakı Şəhər 1 nömrəli (keçmiş Mərəzə qəsəbə) tam orta məktəbinin öz yeri vardır. Onun varlığı böyük bir pedaqoqun adı ilə bağlıdır.

Keçmiş Mərəzə kəndindəki bu məktəbin əsasını 1866-cı ildə tanınmış maarif xadimi Aleksey Osipoviç Çernyayevski qoymuş və müəllimlik vəzifəsini pulsuz olaraq öz öhdəsinə götürmüşdür. İşinə məsuliyyətlə yanaşan pedaqoq müəllim əməyinə yüksək qiymət verərək yazırdı: “İbtidai xalq məktəblərinin canı müəllimdir. Tədris işinin müvəffəqiyyəti ondan asılıdır. Müəllim kənd əhalisinin qaranlıqda qalan kütləsi içərisində maarif işinin pioneridir”.

A.O.Çernyayevski böyük rus pedaqoqu K.Uşinskinin davamçılarından biri kimi öz sələfinin yolu ilə gedərək onun “Ana dili” kitabı kimi, azərbaycanlılar üçün “Vətən dili” (1882) dərsliyini yazmışdır. Bu dərslik uzunömürlü olmuşdur.

XX əsrin ədəbi-mədəni həyatında xüsusi yeri olan ədəbiyyatşünas, tənqidçi, pedaqoq F.Köçərli yuxarıda adı çəkilən kitabları müqayisə edərək demişdir: “Bizim əqidəmizə görə, Uşinskinin “Родное слова” (“Ana dili”) dərsliyi rus məktəbləri üçün hansı əhəmiyyətə malikdirsə, Çernyayevskinin “Vətən dili” dərsliyi də azərbaycanlılar üçün elə bir əhəmiyyətə malikdir”.

Çernyayevski Azərbaycan dilini yaxşı bilirdi, həm də gözəl pedaqoq idi. Onun haqqında çoxlu məqalələr yazılmış, fikirlər söylənilmişdir. “Azərbaycan məktəbi” oxucularına tanış olan bu böyük şəxsiyyətin həyat yoluna bir daha nəzər yetirməyi məqsədəuyğun sayırıq.

Bütün Cənubi Qafqazda pedaqoji fikrin inkişafı tarixində mühüm yer tutan simalardan biri olan A.O.Çernyayevski (1840-1894) Zaqafqaziya (Qori) Müəllimlər

* 7

Seminariyasının Azərbaycan şöbəsinin müdiri kimi məsul vəzifəyə qədər yüksəlmiş, Azərbaycan-rus pedaqoji əlaqələrinin yaranması və inkişafında müstəsna xidmətləri olan maarifçi pedaqoq kimi tanınmış, 54 illik ömründə o, çoxsahəli fəaliyyəti ilə xalqımızın təhsil tarixində şərəfli yer tutan işıqlı şəxsiyyət səviyyəsinə yüksəlmişdir.

A.O.Çernyayevski Şamaxının Mərəzə kəndində anadan olmuşdur. Bu kənd indi Qobustan rayonunun mərkəzidir. İlk təhsilini Şamaxı qəza məktəbində alan və oranı müvəffəqiyyətlə bitirən gənc Aleksey dərhal dövlət qulluğuna göndərilmiş və Mərəzə kəndində stansiya gözətçisi vəzifəsinə təyin edilmişdir. Fikri, düşüncəsi maarif ziyası ilə dolu olan bu gənc elm və təhsilin vurğunu olmuş, ömrünün ən mənalı çağlarını bu sahəyə həsr etmişdir. Fərəhlidir ki, belə bir görkəmli şəxsiyyətin həyat yolu bizim məktəbdən başlanmışdır. Bu böyük pedaqoqu şöhrətləndirən də məhz Mərəzə kənd məktəbi olmuşdur. O zamanlar elə bir dövr idi ki, Rusiyada başlanan ictimai-pedaqoji hərəkat, ölkədə aparılan islahatlar ucqarlara da nüfuz edir və kəndlərdə də dünyəvi təhsil verən xalq məktəblərinin təşəkkülünə rəvac verirdi. Bu böyük hərəkatın iştirakçısı kimi A.O.Çernyayevski Mərəzə kənd məktəbində könüllü olaraq müəllimlik vəzifəsinə başlamış və o öz öhdəsinə düşən vəzifəni şərəflə yerinə yetirmişdir. Uşaqları sevən, ömrünü maarifə həsr edən bu gənc müəllimin heç bir pedaqoji təhsili və təcrübəsi olmasa da, elə ilk günlərdən məktəbdə uşaqların təlim-tərbiyə işini dövrün tələblərinə uyğun qura bilmişdir. Təsadüfi deyildir ki, həmin məktəbin müvəffəqiyyəti elə ilk günlərdən bütün Zaqafqaziyaya yayılmış, hətta "Qafqaz" qəzetində bu barədə yazılar dərc edilmişdir. A.O.Çernyayevskinin sədasını eşidən Qafqaz Tədris Dairəsinin müdiri şəxsən bu məktəbə gələrək onun işi ilə tanış olmuş və özünün 1867-ci ilə aid hesabatında bu barədə Qafqaz canişininə ayrıca məlumat verməyi lazım bilmişdir.

Mərəzə kənd məktəbi digər məktəblərdən fərqli cəhətlərə də malik idi. Hər şeydən əvvəl, A.O.Çernyayevski pedaqoji işə olduqca böyük həvəs göstərir, məktəbin işində təmənnasız və ürəkdən çalışırdı. Orada təhsil pulsuz və kütləvi idi. Çernyayevskinin xalq kütləsinə yaxınlığı hər an hiss olunurdu. Dövlət məktəblərindən fərqli olaraq burada kəndli uşaqları oxuyurdu. Məktəbdə fiziki cəza yox idi. Burada dünyəvi, təbiət və humanitar fənlər tədris olunurdu. Təlimdə əsas yeri mexaniki əzbərləmə deyil, şüurlu mənimsəmə tuturdu. O zaman yeni tipli məktəb adlandırılan belə təhsil ocaqları bizim adi məktəb kimi tanıdığımız məktəblər tipinə yaxın idi.

A.O.Çernyayevski valideynlərin köməyi ilə qısa müddət ərzində məktəb üçün xüsusi bina tikdirmiş, orada kitabxana təşkil etmiş, müvafiq kitablar əldə etmişdi. Tezliklə məktəb öz nüfuzu ilə hamının diqqətini cəlb etdi. Ona görə də şagirdlərin sayı get-gedə artırdı. 1867-ci ildə burada artıq 81 şagird var idi. Çox maraqlıdır ki, Mərəzə məktəbində oğlanlar və qızlar birlikdə oxuyurdular, halbuki o vaxt mövcud olan kənd məktəblərində oğlanlarla qızlar ayrı-ayrılıqda təhsil alırdılar.

Tədqiqatçılar təsdiq edir ki, A.O.Çernyayevski, həqiqətən də, xalq maarifinə təmənnasız xidmət etmək üçün doğulmuşdu. Mərəzə məktəbi ilə bağlı aşağıdakı epizod bu cəhətdən çox xarakterikdir. Qafqaz Tədris Dairəsinin müdiri M.Neverov Mərəzə məktəbinin təşkilində və burada tədrisin yüksək səviyyədə qurulmasında A.O.Çernyayevskinin xidmətlərini qeyd etməyi və onu mükafatlandırmağı Qafqaz canişinindən xahiş edəcəyini söylədikdə, Çernyayevski təvazökarlıqla buna ciddi etiraz edir və xahiş edir ki, müdir bu fikirdən daşınsın. Çünki əgər onun dərs dediyi uşaqların valideynləri

eşitsələr ki, o, öz zəhməti üçün hökumətdən mükafat alır, o vaxt valideynlərin yanında nüfuzunu və etibarını itirər.

İlk addımının uğurlu olması A.O.Çernyayevskini daha da ruhlandırır, haqqında müsbət rəylər eşidilir. Onu şəhər məktəbində işləməyə dəvət edirlər. Bununla da, onun pedaqoji fəaliyyətinin Şamaxı qəza məktəbləri ilə bağlı olan dövrü başlanır. 1867-ci il dekabrın 4-də Aleksey Osipoviç Şamaxı qəza məktəbinin hazırlıq sinfinə müəllim təyin olunur. Artıq onunla maraqlananlar çox idi. 1868-ci ildə o, 2 aylığa Tiflisə gedir və burada pedaqoji təcrübə keçir, elə həmin il noyabrın 24-də Tiflis gimnaziyasında imtahan verərək ibtidai məktəb müəllimi hüququnu alır. Mərəzə təcrübəsi ona az şey verməmişdi. O, Şamaxıda cəmi iki il qalır, 1869-cu il yanvarın 5-də Gürcüstanın Tionet-Duşet ikisinifli ibtidai məktəbinə müəllim və müdir vəzifəsinə təyin olunur və bu vəzifədə təxminən 7 il çalışır. Qafqaz Tədris Dairəsinin illik hesabatlarında Çernyayevskinin buradakı səmərəli pedaqoji fəaliyyətinə aid maraqlı yazılar vardır. O, pedaqoji fəaliyyətə ömrünün mənası kimi baxmışdır. Harada işləməyindən asılı olmayaraq, pedaqoji işə daha çox can yandırırdı.

Çox maraqlıdır ki, Azərbaycan, Bakı onu həmişə özünə çəkirdi.O, öz arzusu ilə Bakıya göndərildi və 1876-cı ildə bir müddət Bakıda Nikolayevski məktəbinin müdiri, Bakı quberniyası və Dağıstan vilayəti xalq məktəbləri direktorunun köməkçisi vəzifəsində çalışdı. Az sonra onun səsi daha uzaqlardan gəldi. O, Kuban vilayətinə göndərilir, harada işləməsindən asılı olmayaraq Aleksey Osipoviçin Zaqafqaziya maarifçiləri arasında xüsusi yeri vardı. Çünki onun ümdə məqsədi xalq kütləri arasında maarifi yaymaq, kasıb uşaqlarını məktəbə cəlb etmək, həqiqi xalq məktəblərinin şəbəkəsini genişləndirmək, təlimdə yeni, mütərəqqi üsullar tətbiq etmək idi. O, Tiflisdə, Bakıda əldə etdiyi təcrübəni burada da yayırdı. Bu istəyə sadiqliyini göstərən A.O.Çernyayevski Azərbaycanın digər maarifçiləri ilə çiyin-çiyinə çalışaraq həmvətənlərini qəflət yuxusundan oyatmaq, feodal qaydaları buxovundan xilas etmək üçün xalq kütlələrini maarifləndirməyi vacib sayırdı və təhsili qurtuluş yolu hesab edirdi. Təsadüfi deyildir ki, A.O.Çernyayevskinin Mərəzədə ilk kənd məktəbini təşkil etməyə ciddi səy göstərməsi, müəllimlik vəzifəsini təmənnasız olaraq öhdəsinə götürməsi, Tiflisdən və Rusiyanın iri şəhərlərindən qəzet, jurnal, tədris vəsaiti gətirməsi xalq arasında maarifi, ibtidai təhsili yaymaq məqsədi də bu amalla bağlı idi.

Sonralar A.O.Çernyayevski öz həyat yoluna nəzər salaraq yazırdı: “Poçt idarəsində qulluq edərək maarifin əhəmiyyətini dərk etdim və Şamaxı qəzasının Mərəzə kəndində kənd məktəbi açdım”. İlk uğurlu addımdan ruhlanan, xalq arasında maarifi yaymağı qarşısına ümdə məqsəd qoyan A.O.Çernyayevski öz fəaliyyətini həmişəlik pedaqoji işə həsr etmiş, xalq maarifinin görkəmli carçısı kimi tanınmışdır. A.O.Çernyayevskinin “Qafqaz” qəzetində dərc etdirdiyi “Zaqafqaziya ölkələrində xalq məktəblərinə dair bir neçə söz”, “Nümunəvi birsinifli kənd məktəbi Moskva politexnik muzeyində”, “Yeni xalq məktəbləri məsələsinə dair”, “Şeyxul-İslam məktəbləri” və s. silsilə məqalələri müəllifin çox dəyərli qələm təcrübələri idi. “Müsəlman ruhaniliyi və xalq məktəbləri” adlı məşhur məqaləsində o, xalq arasında təhsilin zəif yayılmasında ruhaniləri, xüsusilə Zaqafqaziya ruhani idarəsini və onun rəhbərliyini tənqid edirdi. Çernyayevski müsəlman məktəbində oxuyanların sayının azlığına da təəssüflənirdi. O, belə bir fakt gətirirdi ki, 1848-1949-cu illərdə Tiflisdə əsası qoyulan iki müsəlman məktəbini 30 il ərzində cəmi 37 nəfər bitirmişdir. Mövcud ruhani məktəbləri (məktəb və mədrəsələr) A.O.Çernyayevskini təmin

etmədiyi üçün o barədə danışmırdı. Məktəb və mədrəsələrdə ana dilinin tədrisində səs üsulunun tətbiq edilməməsini, mənəvi və fiziki inkişafına hərtərəfli təsir edən təlimin tərbiyəedici xarakterinin bu məktəblərə hələ nüfuz etməməsini də ciddi qüsur sayırdı.

A.O.Çernyayevski Qori Müəllimlər Seminariyasında çalışaraq Azərbaycanı şəhərbəşəhər payi-piyada gəzərək az-çox təhsil alan Azərbaycan balalarını arayıb-axtarır, üzə çıxarıb özü ilə bərabər Qori şəhərinə apararaq 1879-cu ildə Seminariyaya qəbul etdirmişdir. C.Məmmədquluzadə də bunların sırasında olmuşdur. O, on ildən artıq seminariyanın Azərbaycan şöbəsinə ləyaqətlə rəhbərlik etmiş, Azərbaycan müəllimlərinin ilkin dəstəsinin hazırlanmasında birbaşa fəal iştirak etmiş, Azərbaycan maarifi tarixində danılmaz xidmətlər sahibi olmuşdur.

Böyük pedaqoqun Azərbaycan xalq maarifi və məktəb təhsilinin vəziyyətinə həsr edilmiş məqalələri içərisində bir yazısı diqqəti xüsusilə cəlb edir. "Qafqaz müsəlmanları xalq təhsilinin yekunları" adlanan bu irihəcmli məqalə yenə də "Qafqaz" qəzetində dərc edilmişdir. Redaksiyanın qeydindən məlum olur ki, məqalə A.O.Çernyayevskinin ölümündən sonra onun kağızları arasından tapılmışdır. Müəllif bu məqaləsində bütün Qafqazda yaşayan müsəlman əhalisinin ümumi sayının dövlət məktəblərində, eləcə də milli məktəblərdə oxuyan müsəlman tələbələrin (həm oğlan, həm də qız) ümumi sayına nisbəti haqda məlumat verir və bu nəticəni digər xalqların təhsil səviyyəsi ilə müqayisə edərək maraqlı nəticələr çıxarır. O da diqqəti cəlb edir ki, A.O.Çernyayevski yazılarında həmişə azərbaycanlıların mövqeyində dururdu. O, dövrün tələblərinə cavab verən iki hissədən ibarət "Vətən dili" dərsliyi ilə bütün Şərq xalqları içərisində səs metodu əsasında ibtidai siniflər üçün dərslik hazırlatdırıb çap etdirən ilk müəllifdir. "Vətən dili" dərsliyi dəfələrlə nəşr edilmiş və uzun müddət Azərbaycan məktəblərində ana dili dərsliyi kimi istifadə olunmuşdur.

Öz sələflərinin adını hörmətlə çəkən mərəzəlilər məktəbin ənənələrini də qoruyub saxlayırlar. Müəllimlər də, şagirdlər də böyük pedaqoqu hörmətlə xatırlayırlar.

Mərəzə məktəbinin məzunları keçmiş SSRİ-də müxtəlif istiqamətlərdə işləmiş və nüfuz qazanmışlar. Onlardan Viktor Xurusov Aviasiya İnstitutunu bitirmiş, SSRİ Kosmik konstruktorlar bürosunda Sergey Korolyovun rəhbərliyi altında işləmişdir. Vladimir Belov Leninqrad Hərbi Akademiyasını bitirmiş, general rütbəsinə yüksəlmişdir. Mixail Slivestrov kosmik tədqiqatlar üzrə professordur. Vasili və Matvey Popov qardaşları hər ikisi generaldır. Valehmed Seyidov artilleriya polkovnikidir, Qarabağ döyüşlərində rəşadət göstərmişdir. Mariya Poptova Moskva Timiryazyev adına Akademiyanı bitirmişdir, elm sahəsində çalışır. Anna Nojina voleybol üzrə qadınlar arasında respublika çempionudur. Fyodor Truselyov Odessa Tibb İnstitutunu bitirmişdir. Hazırda orada cərrah işləyir. İvan Truselyov Yaroslavl şəhərində zavod direktorudur. Məzunların içərisində pedaqoji sahədə çalışanlar da az deyildir.

Mərəzə orta məktəbinə həmişə təcrübəli direktorlar rəhbərlik etmişdir. Xirusova Anna Vasilyevna, Fərhad Əfəndiyev, son illərdə respublikanın əməkdar müəllimi Feyruz Əfəndiyev məhz belə direktorlardan olmuşdur. Məktəbdə Semyan Sudakov, Alek Nijnikov, Yekaterina Truseleva, Mariya Pçelkina, Zərnişan Məmmədova, Flora Əhmədova, Sona Zahidova, Zeynəb Məmmədova kimi təcrübəli müəllimlər işləmişlər. Uzun müddət Təhsil Nazirliyində məsul vəzifələrdə çalışmış respublikanın əməkdar müəllimi Nəcəf Nəcəfov məktəbdə tarix dərslərini aparmışdır. Elə o illərdə,

1969-cu ildə məktəbin direktoru F.Əfəndiyevlə birlikdə onun "Bakinski raboçi" qəzetində A.O.Çernyayevski və onun Mərəzə məktəbi ilə bağlı fəaliyyəti barədə məqalə dərc olunmuşdur. A.O.Çernyayevskinin 150 illik yubileyi məktəbdə keçirilərkən, təntənəli tədbirdə pedaqoji elmlər doktoru Zahid Qaralov, pedaqoji elmlər namizədi Zemfira Mehdizadə, dosent Nəcəf Nəcəfov və başqaları da iştirak etmişdir. Qobustan və Şamaxı rayonunun ziyalılarının iştirak etdiyi həmin tədbirdə respublikanın əməkdar müəllimi, rayon ziyalılarının ağsaqqalı Davud Orucov çıxış etmişdir. O, Mərəzə məktəbinin müharibə dövründə, ondan sonrakı illərdə fəaliyyətindən danışmış, çox maraqlı məsələlərə toxunmuşdur. Davud müəllim təcrübəli, nüfuzlu təhsil işçisi, uzun müddət qonşu Nərimankənd orta məktəbinin direktoru kimi qonşu Mərəzə məktəbinin uğurlarından və problemlərindən söhbət açmışdır. Mərəzə məktəbinin rəhbərliyi həmişə Davud müəllimlə məsləhətləşər, onun tövsiyələrindən faydalanardı. Məktəbimiz bu gün də öz işini qonşu Nərimankənd, Cəyirli, Sündü, Ərəbqədim, Təklə məktəbləri ilə sıx əlaqə, təcrübə mübadiləsi şəraitində qurur. Məktəbin pedaqoji kollektivi bu ənənələri göz bəbəyi kimi qoruyur.

Məktəbin uğurları da həmişə qənaətləndirici olmuşdur. İndi Qobustan şəhər 1 nömrəli tam orta məktəb adlanan bu məktəbi 2013/2014-cü tədris ilində məktəbi bitirən 40 şagirddən 27-i ali məktəblərə qəbul olunmuşdur. Şagirdlərdən 1-i 652, 7-i isə 500-dən yuxarı bal toplamışdır. XI sinif şagirdi Dadaş Dadaşbəyli ağırlıqqaldırma üzrə Avropa və dünya çempionu olmuşdur. 2014-cü ildə respublika üzrə keçirilən "Xəmsə" intellektual oyunu və "Kim? Nə? Harada?" bilik yarışının qalibləri sırasına çıxmışdır. Bütün bunlarda müəllimlərimizin əməyi az olmamışdır. Əməkdar müəllim Musa Eyyubov, Mirzaman Musayev, Şahin Soltanov, Adil Baloğlanov, Şövkət Mirzəliyeva, Ülviyyə Sabirova, Bəturə Səməd, Turə Orucova, Qurban Qurbanov, Xəyalə Ramazanova, Rəna Dəmirova və s. kimi müəllimlər yüksək nəticələrlə işləyir.

Məktəbin maddi-tədris bazası ildən-ilə möhkəmlənir. İKT-dən istifadə indi adi hala çevrilmişdir. Məktəbdə ölkəşünaslıq məsələlərinə ciddi diqqət yetirilir. Rayon ərazisindəki tarixi abidələrin tədrisində, təbliğində, qorunmasında məktəbimizin müəllimlərinin də əməyi az olmamışdır.

Böyük pedaqoqun adını daşıyan məktəbimiz öz üzərinə düşən vəzifəni yaxşı dərk edir. Əldə olunmuş nailiyyətlər isə bizi arxayınlaşdırmır, gələcək işlərimiz üçün möhkəm zəmin yaranmasına kömək edir.

*Rəyçi: akademik H.Əhmədov*

**И.Сабиров**

**Страница из истории школы**

**Резюме**

В статье говорится об истории одного из первых учебных заведений, о школе имени А.О.Черняевского. Упоминаются заслуги творца этой школы А. О. Черняевского.

**I. Sabirov**

**A page from the history of school**

**Summary**

In the article it is spoken about one of the first educational institutions named after A.O. Chernyayevski, its history and today. The founder of the school Chernyayevski's services is treasured highly.

***İlyas Əfəndiyev-100***

# YADDAŞLARDA YAŞAYAN SƏNƏTKAR

**Qənirə Əmircanova,**
***pedaqogika üzrə fəlsəfə doktoru,***
***əməkdar müəllim***

XX əsr Azərbaycan ədəbiyyatı tarixində İlyas Əfəndiyev qüdrətli nasir və dramaturq kimi tanınmışdır. Teatr mədəniyyətinin inkişafında o, danılmaz xidmətlər göstərmişdir. Müşahidə və mühakimə qabiliyyəti güclü olan istedadlı yazıçı, həm də ictimai xadim idi. Onun qələmindən çıxan bütün əsərlər – hekayə, povest, roman və dram əsərləri həmişə diqqət mərkəzində olmuş, öz dövründə tədqiqat obyektinə çevrilmişdir. Bu fəaliyyəti onu həm də publisistikaya yaxınlaşdırmışdır. Nəticədə yazıçının bir-birindən maraqlı müxtəlif janrda dolğun, bitkin əsərləri yaranırdı. Həyat həqiqətləri və müasirlik onun yaradıcılığının əsas qayəsi olmuşdur. Bu isə İlyas Əfəndiyevin həyata baxışı, dünyagörüşü, insanlara olan sevgisi ilə bağlı idi. Həyat hadisələrinin gedişatını müşahidə edib təhlil etmək, zamanın nəbzini tutmaq, aktual mövzulara müraciət etmək onu hər kəsin sevimli yazıçısına çevirmişdir. O, bütün əsərlərində yenilikçi idi. İlk hekayələrindən son dram əsərlərinə qədər keçən dövr onun sənətkarlığının öyrənilməsi və öyrədilməsi zərurəti yaratmışdır. Heç də təsadüfi deyil ki, onun əsərləri bu gün də sevilə-sevilə oxunur. Qeyd etmək lazımdır ki, bədii əsərlərin bir qədər çətin oxunduğu bir vaxtda İ.Əfəndiyevin əsərləri yenə də öz dəyərini saxlamışdır. Cəmiyyətdə insanları mənfi tiplərə və müsbət obrazlara ayıran ilk dram əsərlərindən olan “Atayevlər ailəsində” pyesində Dilşad xanımların qarşısına sözü və kəsəri olan Xosrov və İldırım Atayev qardaşlarını çıxarır. Kiçik bir dövlət sayılan bu ailəni içəridən parçalamaq üçün iftira və yalan gəncliyin nümayəndələri olan Reyhan, Cahangir, Mehricana əzab verir. Əsərin sonunda müəllif qəhrəmanlarını və oxucusunu həqiqətin qələbə çalacağına, riya və məkrdən uzaq bir ailəyə sahib ola biləcəyinə inandırmağa çalışır.

Yazıçı həmişə hamını – insanları və insanlığı düşüncədə saxlamağı bacarır. Çünki onun qüdrəti həm sevincli, həm də kədərli məqamlarda dönə-dönə yaratdığı qəhrəmanlarla həmsöhbət olmağa səsləyir. Buna isə oxucuların ciddi ehtiyacı vardır.

İlyas Əfəndiyevin yaradıcılığı yaşından asılı olmayaraq heç kəsi yormur, əksinə insanları həyata daha çox bağlayır, ruhdan düşməməyə təhrik edir. XX əsrin klassiki kimi onun surətlərinin dilində səslənən mənəvi dünya çox zəngindir. Yerli-yerində atalar sözlərindən istifadə xalqa bağlılığının sübutudur. Millətinə, xalqına olan sonsuz sevgisi onu sonunda xalq yazıçısı etdi.

Onun haqqında nə qədər yazılsa, yenə də azdır. Xalqın ən böyük şərəf və şöhrətini onun yazıçıları təmsil edir. Ağır bir məsuliyyət daşıyan İ.Əfəndiyev həqiqəti yazmaqdan zövq alırdı. Əslində yazıçılığın missiyası öz sözlərini deyə bilməyənlərin və ya demək iqtidarında olmayanların fikirlərini sözə çevirməkdən ibarətdir. Və bu şərəfli vəzifəni ləyaqətlə yerinə yetirən ədib yazıb-yaratmaqdan yorulmayan bir ömür yaşamışdır.

Təsadüfi deyil ki, bütün türk aləminə səs salan “Sarıköynəklə Valehin nağılı” oxucular və tənqidçilər arasında geniş maraq

doğurmuşdur. Yazıçılar İttifaqının o vaxtkı rəhbərliyi İmran Qasımovun razılığı ilə akademik Bəkir Nəbiyev tərəfindən Natəvan klubunda əsərin geniş müzakirəsi təşkil olunmuşdur. Bu elə bir zaman idi ki, çox ciddi neqativ hallar kəskin bədii tənqidin hədəfinə çevrilirdi. Yazıçılar İttifaqının rəhbərliyindən izahatlar tələb olunurdu. Nəhayət, ulu öndər Heydər Əliyevə Yazıçılar İttifaqının sədrinin bu mövzuda tez-tez müraciəti “Sarıköynəklə Valehin nağılı” ətrafında qızışan təqib və təxribata son qoydu. Və dəfələrlə Heydər Əliyev İlyas Əfəndiyevin əsərləri ilə yaxından tanış olmuş, pyeslərinin tamaşalarına baxmış, özünün dediyi kimi ”onun bütün yaradıcılığını böyük minnətdarlıq hissi ilə xatırlamışdır.”

Böyük tarixi hadisələrin şahidi olan İlyas Əfəndiyev 1990-cı il yanvarın 20-də Bakıda qəfildən güllləbaran edilmiş Azərbaycan şəhidlərinin əbədi xatirəsinə ithaf etdiyi “Hökmdar və qızı” dramı illərin yığılmış əzablarının söz və fikir ifadəsi idi. Dramın son hissəsində İbrahim xanın qızı Ağabəyim ağanın dilindən söylənən fikirlər müəllifin bağrından süzülən fəryad idi: “Bu dəhşətdir, ilahi! Azərbaycan torpağında axıdılan bu günahsız qanlar bəs deyilmi? Ey böyük yaradan, sənin dərgahında mənim günahım necə böyükdür ki, mənə bu qədər əzab verirsən? Gör neçə ildir ki, mən bu qara libasdan çıxa bilmirəm. Əvvəl bu dünyadan nakam köçmüş bacım Səltənət bəyim... Sonra da... Yerlər, göylər bu dəhşətə necə dözdü, necə? Elə bil, məni dəmir məngənə arasına qoyub sıxırlar. Qoy böyük Yaradan sizin kimi Azərbaycan igidlərinin qılıncını əlindən salmasın. Bu yalnız bizim faciəmiz deyil. İbrahim xanın rus padşahının sözlərinə inanıb, ona tabe olması bizim gələcək nəsillərimizin də faciəsidir. İbrahim xanın bu səhvi onları da tarixin müşkül tilsiminə saldı. Mənim əziz həmvətənlərim, Azərbaycan türkləri heç bir zaman yadelli padşahın zülmünə tabe olmayacaq. Həmişə vətənin azadlığı uğrunda vuruşacaq”.

Xalq yazıçısı, Dövlət mükafatı laureatı, əməkdar incəsənət xadimi, “Şöhrət” ordenli nasir, publisist, dramaturq, novator sənətkar İlyas Əfəndiyevin yaradıcılığının əsas məqsədi sadə həyat hadisələrini mənalandırmaq, onları yaradıcılıq süzgəcindən keçirərək lirik-romantik vüsət vermək, hər bir obrazın daxili aləmini, əxlaqi-psixoloji vəziyyətini maraqlı üsulla təsvir etməkdir. O, bütün əsərlərinin mövzusunu bütöv Azərbaycan xalqının həyatından, onun mübarizə və döyüşlərdə keçən tarixi keçmişindən götürmüşdür. Maraqlı cəhət odur ki, təsvir etdiyi hadisələri ümumbəşəri səviyyəyə qaldırır, hamını düşünməyə, həyat hadisələrindən düzgün nəticə çıxarmağa təhrik edir. Ona görə ki, müasirlik, tarixilik və novatorluq onun yaradıcılığının əsas məziyyətlərindən biridir. İlyas Əfəndiyev nədən və kimdən yazırdısa, onun təsvir etdiyi qəhrəman oxucunun müasirinə çevrilirdi. Bu da ən çox yazıçının dilinin səlis, gözəl, maraqlı, oxunaqlı və təbiiliyi ilə bağlı idi. İlyas Əfəndiyevin əsərləri mövzusundan asılı olmayaraq, heç kəsi yormur, əksinə, oxucu hadisələrin axarına düşüb, canlı iştirakçıya çevrilir.

“Bahar suları” pyesində sevdiyi qəhrəmanı Uğurun dilindən söylədiyi “Mən dövlət ona deyirəm ki, qızıl zəmilər dərya kimi dalğa vurub həyatı öz ağuşuna alsın” fikirləri yazıcı uzaqgörənliyindən xəbər verir. Yaratdığı surətlərlə hadisələri qabaqlayan ədib Azərbaycanın bu gününü görür, dövlətimizin gələcəyinə inanırdı. İnanırdı ki, “Azərbaycan dünyaya bir günəş kimi doğacaqdır”.

İlyas Əfəndiyevin milli mənəviyyat xəzinəmizi zənginləşdirən irsi zaman ötdükcə öz dərin məndəricəsi, ədəbi-estetik təsir qüvvəsi və təravəti ilə nəsilləri daim xoşbəxt həyat uğrunda mübarizəyə ruhlandıracaqdır.

*"Azərbaycan məktəbi"-90*

# GƏNCLİYİMİN BƏLƏDÇİSİ

**Vidadi Xəlilov,**
***pedaqoji elmlər doktoru, professor***

Elmi-pedaqoji ictimaiyyətin dərin rəğbətini qazanmış "Azərbaycan məktəbi" jurnalının nəşrə başlamasının 75 illiyi tamam olur. Bu əlamətdar hadisə jurnalın digər oxucuları və müəllifləri kimi məni də qəlbən sevindirir. Həmişə bizə örnək olan sevimli jurnalımızın 75 illiyi ərəfəsində qanuni iftixar hissi keçirirəm. Ona görə ki, bu mötəbər nəzəri, pedaqoji-metodik jurnal başa çatmaqda olan əsrimizin birinci yarısından başlayaraq xalqımızın – müxtəlif nəsildən olan insanların elmə - təhsilə, mədəniyyətə yiyələnməsində çox iş görmüş, bu yolda böyük fədakarlıq nümunəsi göstərən ziyalıların yolunu işıqlandırmışdır.

"Azərbaycan məktəbi" mənə nə verib? Bu suala qısaca belə cavab verərəm: çox şey. Pedaqoji elmlər doktoru, professor kimi yetişməyimdə, "qabaqcıl maarif xadimi", "SSRİ Maarif əlaçısı" adlarına layiq görülməyimdə, Azərbaycan Gənclər İttifaqı Mükafatı və Akademik M.Mehdizadə adına mükafat laureatı kimi tanınmağımda "Azərbaycan məktəbi" jurnalının çox böyük rol oynadığını səmimi qəlblə etiraf edirəm və bunu ömrüm boyu unutmaram...

Yaxşı yadımdadır, 1961-ci ildə V.İ.Lenin adına APİ-nin (indiki N.Tusi adına ADPU) pedaqogika və ibtidai təhsil metodikası fakültəsində - II kursda oxuyurdum. Pedaqogika fənnindən "Kiçikyaşlı məktəblilərin əxlaq tərbiyəsində müəllimin şəxsi nümunəsinin rolu" mövzusunda kurs işi yazmalı idim. Bu fənni tədris edən pedaqoji elmlər namizədi, dosent İsfəndiyar Vəlixanlı müvafiq məsləhət verdikdən sonra "Azərbaycan məktəbi" jurnalının 1960-cı ildə buraxılmış 6-cı nömrəsini mənə verib dedi:

-Kurs işinin daha məzmunlu alınması üçün jurnalın bu nömrəsində verilmiş məqalələrə diqqət yetirməlisən. O, maarif naziri professor M.Mehdizadənin "Məktəblərin yenidən qurulmasının ilk yekunları, məktəb və maarif işçilərinin yaxın vəzifələri haqqında", həmçinin pedaqoji elmlər namizədi, dosent Aben Kərimovun "Tərbiyə işləri proqramı haqqında" məqalələrini xüsusi nəzərə çatdırdı. Onu da əlavə etdi ki, əlaçı – ictimaiyyətçi tələbələr pedaqoji mətbuata, xüsusilə "Azərbaycan məktəbi" jurnalına, "Azərbaycan müəllimi" qəzetinə abunə yazılsalar çox şey qazanarlar. Biz sevimli müəllimimizin dediyinə əməl etdik. APİ-nin Bakıxanov küçəsində yerləşən tələbə yataqxanasında yaşamağımıza baxmayaraq "Azərbaycan məktəbi" jurnalına və "Azərbaycan müəllimi", "Azərbaycan gəncləri", "Azərbaycan pioneri" qəzetlərinə abunə yazıldıq (jurnalı və qəzetləri yataqxanada yerləşən kitabxanaya gətirirdilər). Bu, tələbələr arasında artıq ənənə şəklini aldı. Sonralar professor Mərdan Muradxanov fakültə dekanı dosent İ.Vəlixanlının bu təşəbbüsünü bir sıra elmi məclislərdə xüsusi olaraq nəzərə çatdırdı və yüksək qiymətləndirdi. Bəli, sevimli, unudulmaz müəllimlərimizin hər

ikisi indi haqq dünyasındadırlar. Allah onlara rəhmət eləsin! Qəbirləri nurla dolsun!

Respublikamızda möhtəşəm təhsil ocağı kimi tanınmış APİ-nin 60-cı illərin məzunları adından cəsarətlə deyə bilərəm ki, unudulmaz müəllimlərimizin hələ tələbə ikən "Azərbaycan məktəbi" jurnalı ilə təmasda olmağımıza düzgün istiqamət verməläri müsbət təsirini göstərdi. Bu gün respublikamızın elmi-pedaqoji ictimaiyyəti arasında səmərəli tədqiqatları, nüfuzları ilə tanınan pedaqoq-psixoloq alimlərin bir çoxu məhz APİ-nin 60-cı illərinin məzunlarıdır. Mübaliğəsiz deməliyəm ki, onların uğurlarında "Azərbaycan məktəbi" jurnalının böyük, əvəzedilməz rolu var. Mən də 1968-ci ilin noyabrında Azərbaycan Dövlət Elmi-Tədqiqat Pedaqogika İnstitutunun aspiranturasına qəbul olunandan sonra bu mötəbər jurnalın redaksiyası ilə əməkdaşlığa başladım. "İbtidai siniflərdə Azərbaycan xalq yaradıcılığı nümunələrinin öyrədilməsi estetik tərbiyə vasitəsi kimi" mövzusunda namizədlik dissertasiyamla bağlı ilk məqaləm də "Azərbaycan məktəbi" jurnalının 1970-ci il 7-ci nömrəsində dərc olundu. Bu məqalə o zaman apardığım tədqiqatın əsas istiqamətləri haqqında müvafiq mütəxəssislərdə aydın təsəvvür oyatdı. Mübaliğəsiz deməliyəm ki, jurnalla əməkdaşlıq etdiyim ötən 30 il ərzində redaksiya əməkdaşlarının və baş redaktorlarının böyük diqqət və qayğısını hiss etmişəm. Lakin səmimiyyətlə etiraf edim ki, 1981-ci ildən jurnalın baş redaktoru kimi səmərəli fəaliyyət göstərən filologiya elmləri namizədi, respublikanın əməkdar müəllimi Zəhra xanım Əliyeva tədqiq etdiyim sahəyə böyük maraq göstərmiş, müvafiq şöbələr tərəfindən sifarişlərin verilməsini lazım bilmişdir. "Məktəbdə estetik mədəniyyətin yaradılması yolları" (1983, №3), "Məktəbdə estetik tərbiyəni təkmilləşdirməyin əsas istiqamətləri" (1983, №8), "Şagirdlərin estetik tərbiyəsi və inkişafı" (1984, №3), "Şagirdlərin bədii yaradıcılığının təşkili" (1985, №9), "Məktəbin və tədris kabinetlərinin əyani-bədii tərtibinə dair" (1986, №4), "Gənc nəslin estetik tərbiyəsi problemləri" (1988, №8), "İstedadları necə aşkara çıxarmalı" (1989, №8) və digər onlarca məqaləni redaksiyanın sifarişi ilə yazmışam.

"Azərbaycan məktəbi" jurnalına əlavələr kimi nəşr edilmiş "İbtidai məktəb və məktəbəqədər tərbiyə" (indi müstəqil jurnal kimi çıxır – redaktoru professor Y.Kərimovdur), "Əmək və politexnik təlim" (redaktoru baş elmi işçi İ.Mayılov), "Məktəbdə bədən tərbiyəsi" (redaktoru dosent M.Nəsrullayev) metodik məqalələr məcmuəsində dərc edilmiş silsilə məqalələrim də redaksiyanın etimadı nəticəsində mümkün olmuşdur.

Estetikanın pedaqogikası üzrə apardığım tədqiqatların əsas məzmunu da ilk dəfə "Azərbaycan məktəbi"nin səhifələrində öz əksini tapıb. Keçmiş SSRİ-nin ayrı-ayrı respublikalarında, o cümlədən Ukrayna, Latviya, Özbəkistan respublikalarında estetik tərbiyə probleminin qoyuluşu ilə bağlı məqalələrim də "Azərbaycan məktəbi"nin səhifələrində dərc olunub. Bu mötəbər jurnal sözün həqiqi mənasında elm-təhsil məktəbi kimi qələmimi püxtələşdirib, yeni-yeni tədqiqatlara ruhlandırıb. İndiyədək namizədlik dissertasiyası müdafiə edən aspirant və dissertantlarımın adından da "Azərbaycan məktəbi" jurnalının yaradıcı, zəhmətsevər kollektivinə səmimi qəlblə çox sağ olun deyirəm!

Ömrünüz uzun, yaradıcılıq uğurlarınız daha da çox olsun! Yüz illik yubiley təntənənizi görmək arzusu ilə!...

**"Azərbaycan məktəbi", 1999, №2**

**(*Jurnalımızın arxivindən*)**

***Rəy və təkliflər***



# "AZƏRBAYCAN MƏKTƏBİ" JURNALINA YENİ İL ARZULARIM

**Əjdər Ağayev,**
***Azərbaycan Təhsil Şurasının sədri, pedaqoji elmlər doktoru, professor, əməkdar müəllim, Prezidentin fərdi təqaüdçüsü, "Azərbaycan məktəbi" jurnalının redaksiya heyətinin üzvü***

Təhsil elə bir sahədir ki, onun təşkili və həyata keçirilməsi ilə yanaşı, təbliğinə, tədqiqinə də ehtiyac vardır.

XX əsrin əvvəllərindən başlayaraq, Azərbaycanda təhsil-tədris işləri ilə əlaqədar pedaqoji mətbuat yaradılmışdır. 1906-cı ildən fəaliyyət göstərən "Dəbistan", 1911-ci ildən onun işini davam etdirən "Məktəb" və "Rəhbər" jurnalları öz dövrünə görə təhsil işinin təşkili, tədris təcrübəsinin yayılması və oxucularına müxtəlif informasiyaların çatdırılması sahəsində təsiredici işlər görmüşdür. 1924-cü ilə qədər uşaq ədəbiyyatını da əhatə edən bu jurnallar fasilələrlə nəşr edilmişdir. 1924-cü ildən isə sırf pedaqoji mahiyyətli və Maarif Nazirliyinin orqanı olan "Yeni məktəb" jurnalı nəşrə başladı. Elmi-nəzəri və metodiki məqalələri ilə təhsil və tədris işinin inkişafında, müasirləşməsində, qabaqcıl təcrübənin yayılmasında mühüm rol oynayan bu pedaqoji jurnal müxtəlif adlarla bu günə qədər öz missiyasını yerinə yetirməkdədir. 1943-cü ildən "Azərbaycan məktəbi" adı ilə tanınan bu jurnal bu gün yeniləşən cəmiyyətin yeniləşən təhsilinin təşkilində xüsusi əhəmiyyət daşıyır.

"Azərbaycan məktəbi" jurnalı bütün təhsil sistemini əhatə edərək onun problemlərinin həllinə çalışır. Bu jurnalın səhifələrində təhsilin idarə edilməsi, təlim və tərbiyə məsələləri, pedaqoji fikir tarixi, kadr hazırlığı və digər rubrikalar altında nəzəri və praktik əhəmiyyətli məqalələr çap edilir.

Təbii ki, "Azərbaycan məktəbi" jurnalı redaksiyasını günün aktual problemləri daha çox maraqlandırır. Təhsil İslahatından alınan nəticələr, məzmun yenilikləri, müasir təlim metod və texnologiyaları, İKT-dən istifadə, beynəlxalq təcrübənin öyrənilib yayılması və bu qəbildən olan digər məsələlər "Azərbaycan məktəbi" jurnalının müraciət etdiyi əsas mövzulardandır və iş davam etdiriliməlidir.

Bəllidir ki, pedaqoji ictimaiyyətin müasir tələblər səviyyəsində özünü hazırlamasında pedaqoji mətbuatın danılmaz rolu vardır. Bu baxımdan "Azərbaycan məktəbi" jurnalı öz funksiyasını lazımınca yerinə yetirir. Jurnalda çıxış edən müəlliflər mövcud təhsil təcrübələri ilə yanaşı, yeni qazanılan iş təcrübələrini də geniş şəkildə əks etdirirlər. Hazırda geniş fəaliyyət göstərən dövlət və özəl məktəbləri, fasiləsiz təhsil mərkəzləri, təlim kursları insan kapitalının formalaşdırılmasında mühüm əhəmiyyət daşıyır…

Hələ şagird ikən bu jurnalın nüsxələrini evimizdə görmüşəm və şagird anlamı ilə oxumuşam. Müəllimim və böyük qardaşım Abuzər Ağayev 1943-cü ildən başlayaraq bu jurnalın müntəzəm abunəçisi idi. O zamanlar "Azərbaycan məktəbi" jurnalı fənlərin tədrisi məsələlərinə, filologiyaya, tarixə, etnoqrafiya, poeziyaya da yer verirdi. Şəkidə toy adətləri, Azərbaycan dilçiliyi, Azərbaycan tarixi və müharibə qəhrəmanları haqqında, eləcə də bir sıra şairlərin şeirlərini ilk dəfə 1946-cı ildə nəşr olunmuş "Azərbaycan məktəbi" jurnalında oxumuşam və indiyədək yadımdadır. 70 ilə yaxındır ki, mən "Azərbaycan məktəbi" jurnalının oxucusuyam. Qeyd etmək istərdim ki, bütün dövrlərdə "Azərbaycan məktəbi" jurnalı təbliğ, təşviq və təşkiletmə fəaliyyətini uğurla yerinə yetirir. Əgər 1950-1960-cı illərdə jurnalda daha çox ümumpedaqoji və metodik məqalələr geniş yer tutmuşdursa, son onilliklərdə pedaqoq alimlərin elmi-tədqiqat nəticələrinin oxuculara çatdırılmasına da xüsusi yer verilmişdir. Deməli, təhsilimizin bu qocaman mətbuat orqanı təhsilin və elmin inkişafında pedaqoji və elmi kadrların yetişdirilməsində mühüm rol oynamışdır.

Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası sənədi təhsilin və təhsil işçilərinin qarşısında yeni mühüm vəzifələr qoyur. Jurnal tarixi təcrübəni, nailiyyətləri təbliğ etməklə yanaşı, Dövlət Strategiyasında müəyyənləşdirilmiş hədəflərə çatmaq üçün yeni iş, forma və metodlarının oxuculara çatdırılmasına fəal münasibət göstərir.

Azərbaycanda təhsilin beynəlxalq təhsil təcrübəsinə inteqrasiyası, dövlətin təhsil sisteminin inkişafına göstərdiyi böyük qayğı, maddi-texniki bazanın və digər təlim təchizatının, yeni texnologiyaların tətbiqi sürətlə həyata keçirilir. Heç şübhəsiz, "Azərbaycan məktəbi" jurnalı redaksiyası ənənələrinə sadiq qalaraq, inkişaf edən Azərbaycanın dövlətçilik və azərbaycançılıq prinsiplərini əsas götürərək, mətbu sözün imkanlarından lazımınca istifadə etməkdədir.

Ölkə prezidenti cənab İlham Əliyevin rəhbərliyi ilə Azərbaycan ildən-ilə yeni nailiyyətlər qazanır. Bu nailiyyətlərdə təhsil sahəsində çalışanların da öz payı vardır.

"Azərbaycan məktəbi" jurnalının hər sayını vərəqlədikcə ötən ayların tarixə saldığı uğurlu izlərini görürük. 2014-cü il təhsilin yeni inkişaf mərhələsi ilə səciyyələnir. 2014-cü ilin bizimlə vidalaşması kövrək hislər doğursa da, onun nailiyyətləri xoş təəssürat yaradır. 2015-ci ildə təhsilimizin bütün sahələrində keyfiyyət uğurlarını görmək arzusundayıq. Heç şübhəsiz, "Azərbaycan məktəbi" jurnalı redaksiyası yeni ildə də öz fəallığını nümayiş etdirəcəkdir. İlin ən yaxşı məktəbləri haqqında, ilin ən yaxşı müəllimlərinin iş təcrübəsinə, dünya təhsilinə inteqrasiyaya dair məlumatların, yeniliklərin müntəzəm işıqlandırılması da ürəyimizcə olardı. "Azərbaycan məktəbi" jurnalının redaksiya heyətini, əməkdaşlarını, dəyərli oxucularını təbrik edir, onlara yeni ildə qarşıya qoyulmuş vəzifələrin yerinə yetirilməsində daha böyük uğurlar arzulayıram.

Bir arzum da odur ki, oxucular jurnalda gedən yazılara tənqidi yanaşsınlar, öz rəy və təkliflərini redaksiyaya göndərsinlər. Daha hansı müəlliflərin məqalələrini gözlədiklərini də redaksiyaya bildirsinlər.

Jurnalda "Bizə yazırlar" rubrikası altında jurnala istər şifahi, istər yazılı şəkildə müraciət edən müəllimlərin adlarının göstərilməsi də məqsədəuyğun olardı. Məncə, bu yolla müəlliflər arasında əlaqə daha da genişlənir.

"Azərbaycan məktəbi"nin oxucularla əlaqəsinə dair mövcud olan ənənələr isə daha müasir formada davam etdirilməlidir. Bu sahədə redaksiyaya, oxucular da fəallıq arzu edirik.

***Rəy və təkliflər***



# MƏTBUATIMIZA ARZULARIMIZ

**Rzaqulu Şərifov,**
***Bərdə Rayon Təhsil Şöbəsinin müdiri,***
***əməkdar müəllim***

Son illərdə təhsil islahatı sahəsində danılmaz uğurlar qazanılmışdır. "Azərbaycan məktəbi" jurnalı rayon müəllimlərinin ən çox maraqlandığı mətbuat orqanıdır. Təhsilimizin inkişafı, bu günü və sabahına dair məqalələr müəllimlərimizin elmi-nəzəri və pedaqoji hazırlığına yaxından kömək edir.

Təhsil Nazirliyinin qərar və göstərişlərinə dair informasiyaları, ilk növbədə "Azərbaycan müəllimi" qəzeti və "Azərbaycan məktəbi" jurnalı vasitəsilə alırıq. Rayonumuzun pedaqoji kollektivi də öz işlərini bu aspektdə qururlar.

Hazırda Azərbaycan təhsil sistemində ciddi və əsaslı islahatlar aparılır. Təhsilin məzmunu, təlim metodları yenilənir, müasir yanaşmalar tətbiq olunur. Milli-mənəvi dəyərlərə söykənən tərbiyə sistemi formalaşır. Ölkəmizdə bu sahədə əldə edilmiş uğurlarda Bərdə rayonunun da öz payı vardır. Bu da təbiidir.

Çox təəssüf ki, "Azərbaycan məktəbi" jurnalında Bərdə rayonunun adına az rast gəlirik. Məktəblərimizin və müəllimlərimizin iş təcrübəsi, uğurları az işıqlandırılır. Bu da, heç şübhəsiz, müəllimlərimizin təhsil sahəsində aparılan islahatlar, iş təcrübəsində əldə etdiyi nailiyyətlər və təlim prosesində qarşıya çıxan problemlər barədə düşüncələrini məqalə şəklində ifadə etməyə səy göstərməmələri ilə bağlıdır. Necə deyərlər, jurnal da bizə "qonaq" gəlmir. Bəlkə belə olsa, onun oxucuları da çox olar. Rayonumuzun pedaqoji kollektivi ilə bu istiqamətdə işlər aparılır.

Azərbaycan təhsilində öz sanballı çəkisi olan regionlardan biri sayılan Bərdə rayonu tarixi şəhər kimi həmişə nüfuzunu qorumağı öz mənəvi borcu saymışdır. Geniş təhsil şəbəkəsi olan bu rayonda 2013/2014-cü dərs ilində 75 ümumtəhsil məktəbi, o cümlədən 59 tam orta, 11 ümumi orta, 5 ibtidai məktəb fəaliyyət göstərmişdir. Bu məktəblərdə təhsil alan 20897 şagirdin təlim-tərbiyəsi ilə 3214 müəllim məşğul olmuşdur. Onlardan 2533 nəfəri ali, 782 nəfəri orta-ixtisas təhsillidir. Müəllim şagird nisbəti 1:6,3 təşkil etmişdir.

Yeni dərs ili ərəfəsində - avqustun 20-də Təhsil Nazirliyində keçirilən müşavirədə təhsil naziri Mikayıl Cabbarov ötən dərs ilinin əlamətdar hadisələrlə yadda qaldığını və ölkə təhsilinin strateji inkişafı baxımından başlanmış islahatların uğurla davam etdirildiyini, ötən dərs ilində təhsilin inkişafı ilə bağlı bir sıra əhəmiyyətli sənədlərin qəbul edildiyini bir daha vurğuladı. Müəllim fəaliyyətinin səmərəliliyinin artırılması, tədris resurslarının hazırlanması, təhsil müəssisələrinin işinin günün tələbləri səviyyəsində təşkili və mövcud olan mənfi hallara qarşı mübarizə sahəsində aparılan islahatların müsbət nəticələr verməsini təqdirəlayiq hal kimi dəyərləndirdi.

Təhsil Nazirliyinin göstərişlərinə əməl olunaraq il ərzində bizim rayonda da ən yaxşı müəllimlərin aşkar edilib, qabaqcıl təcrübənin yayılması, müəllimlərin bilik və

bacarıqlarının daim artırılması kimi məsələlərinə fikir verilmişdir. Dərs ili ərzində məktəblərdə ayrı-ayrı fənlərdən açıq dərs keçirilmişdir.

Təhsil Sektorunun İnkişafı üzrə İkinci Layihənin (TSİİL) "Pedaqoji kadrların ixtisasartırma təhsilinin müasirləşdirilməsi" 2-ci komponentinin icra planına uyğun olaraq rayonumuzda da əhəmiyyətli işlər görülür. Belə ki, sentyabr ayında "İdarəetmədə qərarların verilməsi üçün təhsilalanların nailiyyətlərinin qiymətləndirilməsi və monitorinq tədqiqatları nəticəsindən istifadə" mövzusunda 5 günlük təlim kursları təşkil edilmişdir. Kursları müvəffəqiyyətlə bitirən 29 nəfərə Təhsil Nazirliyinin sertifikatları verilmişdir.

Təhsil nazirinin əmrinə əsasən xüsusi istedada malik uşaqların vaxtından əvvəl I sinfə qəbulu üçün komissiya tərəfindən rayon üzrə 164 nəfər uşaq qeydə alınmış, 54 nəfərin I sinfə qəbuluna icazə verilmişdir.

Şagirdlərin intellektual səviyyəsinin yüksəldilməsində, zehni və məntiqi düşüncəsinin inkişafında onların milli və ümumbəşəri dəyərlərə yiyələnməsində xüsusi əhəmiyyəti olan intellektual bilik yarışının keçirilməsinə ardıcıl fikir verilməkdədir.

Azərbaycan Respublikası Nazirlər Kabinetinin 15 avqust 2014-cü il tarixli, 279 nömrəli qərarı ilə "Pedaqoji pofilli ixtisaslar üzrə ali və orta-ixtisas təhsili müəssisələrini bitirmiş və ümumi təhsil müəssisələrində işə başlamış gənc mütəxəssislər üçün əlavə güzəştlər və stimullaşdırıcı tədbirlərin müəyyən edilməsi haqqında" Nazirlər Kabinetinin 14 aprel 2010-cu il tarixli, 67 nömrəli qərarında dəyişiklik edilib. Bu dəyişikliyə əsasən rayon mərkəzindən 20 kilometrdən artıq məsafədə yerləşən ümumi təhsil müəssisələrində əmək fəaliyyətinə başlayan gənc mütəxəssislərə veriləcək kompensasiya və əlavənin ümumi miqdarı 160 manata qaldırılmışdır.

Qərarda əhəmiyyətli yeniliklərdən biri də ondan ibarətdir ki, 3 illik müddət bitdikdən sonra həmin və ya digər kənd məktəbində pedaqoji fəaliyyətini davam etdirən gənc mütəxəssislərə daha 2 il müddətinə kompensasiya və əməkhaqqına əlavələr ödənilir. Müddətin uzadılması gənc mütəxəssislərin işlədikləri kənddə məskunlaşmasının təmin olunmasına xidmət edəcəkdir.

Nazirlər Kabinetinin 2013-cü il 27 dekabr tarixli qərarı ilə bütün tipdən olan ümumi təhsil məktəblərində müəllimlərin həftəlik dərs yükünün maksimum həddi 24 saatdan 36 saata qaldırılıb.

Ötən dərs ilində mənəvi tərbiyənin ən mühüm tərkib hissəsi olan hərbi vətənpərvərlik tərbiyəsi də diqqət mərkəzində saxlanılmışdır.

Həyata keçirilmiş tədbirlərin nəticəsidir ki, bu il Naxçıvanski adına hərbi liseyə 4 nəfər, Ali Hərbi Məktəbə 2 nəfər, Sərhəd Xidməti Akademiyasına 5 nəfər, Türkiyə Ali Hərbi məktəbinə 3 nəfər, Ali Hərbi Həkimliyə 1 nəfər, Daxili Qoşunlar Akademiyasına 2 nəfər, Polis Akademiyasına 2 nəfər, Milli Təhlükəsizlik Akademiyasına 2 nəfər, Milli Aviyasiya Akademiyasına 1 nəfər qəbul olunmuşdur.

Azərbaycan təhsil sistemindəki uğurlar bütün rayonlar kimi, Bərdə rayon təhsil işçilərinin də üzərinə şərəfli vəzifələr qoyur. Onlar bunu yaxşı dərk edirlər və gələcək illərdə də daha böyük əzimlə işləmək, əldə olunan uğurları daha da möhkəmləndirməyə səylə çalışacaqlar.

Ümidvarıq ki, yeni ildə "Azərbaycan məktəbi" jurnalının Bərdə rayonundan da müəllifləri olacaq və onlar ölkəmizdə aparılan təhsil quruculuğuna dair öz fikirlərini söyləyəcəklər. Bu da təbiidir. Çünki bu günün əsas tələbi qarşımızda duran hədəflərin müəyyənləşdirilməsindən asılıdır.

# OXUCULARLA GÖRÜŞ KEÇİRİLMİŞDİR

Noyabrın 25-də Bakı şəhəri 220 nömrəli məktəbdə "Azərbaycan məktəbi" jurnalının oxucularla görüşü keçirilmişdir. Görüşü giriş sözü ilə açan 220 nömrəli məktəbin direktoru, əməkdar müəllim Almaz Əsgərova "Azərbaycan məktəbi" jurnalının baş redaktoru, filologiya üzrə fəlsəfə doktoru, əməkdar müəllim, dosent N.Nəcəfovu, jurnalın redaksiya heyətinin üzvü, pedaqogika üzrə elmlər doktoru, Prezidentin fərdi təqaüdçüsü, Respublika Təhsil Şurasının sədri, professor Ə.Ağayevi, jurnalın baş redaktorunun müavini, Azərbaycan Jurnalistlər Birliyinin üzvü Nəsrəddin Musayevi, Təhsil Problemləri İnstitutunun professoru Vidadi Xəlilovu, Azərbaycan Müəllimlər İnstitutunun dosentləri Bilal Həsənli və Şahrza Ağayevi, Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti Baloğlan Quliyevi, Təhsil Texnologiyaları Mərkəzinin direktoru Muxtar Həsənovu, Bakı şəhəri üzrə Təhsil İdarəsi metodiki mərkəzinin əməkdaşları Alı Məmmədovu, Mövlan Ömərovu, Bakı şəhəri 70 nömrəli məktəbin direktoru, fizika-riyaziyyat elmləri üzrə fəlsəfə doktoru Nazim Qasımovu, Bakı şəhəri 129 nömrəli məktəbin direktoru Samir Mehdizadəni və başqa qonaqları salamlayaraq, onların bu tədbirdə iştirakından məmnun qaldığını bildirmişdir.

Görüşdə "Azərbaycan məktəbi" jurnalının 90 illik tarixi yolundan danışılmış, müstəqillik illərində jurnalın təhsil islahatı, Milli Kurikulumun tətbiqində qazanılmış uğurların işıqlandırılmasından söhbət getmiş və bu aspektdə jurnalın fəaliyyətindən söhbət açılmışdır.

Tədbirdə məktəb müəllimlərinin çıxışları, sualları, rəyləri və təklifləri dinləyicilər tərəfindən rəğbətlə qarşılanmışdır. Görüşdə müəllimlərdən Elnarə Məmmədova (Bakı şəhəri MLK), Şakir Babayev (Lerik rayonu, Lüləkəran kənd tam orta məktəbinin direktoru), Təranə Axundova, Zeynəb Rzayeva (220 nömrəli məktəb), Gülşən Vəliyeva, Dilarə Məcidova, Zabilə Əliyeva, Bayram Mehrəliyev (70 nömrəli məktəb), Leyla Qurbanova (Heydər Əliyev adına lisey) və başqaları jurnala dair irad və təkliflərini bildirməklə, belə görüşlərin tez-tez keçirilməsini arzu etmiş, pedaqogika, psixologiya elminin ən aktual məsələləri ilə yanaşı, jurnalda ayrı-ayrı müəllimlərin dərs nümunələrinin, qiymətləndirmə ilə əlaqədar əldə olunmuş təcrübələrə dair yazıların müntəzəm verilməsini vacib saymışlar.



Müəllimlərin suallarını cavablandırarkən Ə.Ağayev, V.Xəlilov, B.Həsənli, Ş.Ağayev onlara bir sıra tövsiyələr də verdilər. Görüşün sonunda jurnalın baş redaktoru N.Nəcəfov tədbirin keçirilməsini yüksək səviyyədə təşkil etmiş 220 nömrəli məktəbin pedaqoji kollektivi və onun direktoru Almaz xanım Əsgərovaya, jurnal haqqında dəyərli rəy və təkliflərini bildirən oxuculara öz təşəkkürünü bildirmişdir. Yığıncaq iştirakçılarına "Azərbaycan məktəbi" jurnalının nüsxələri paylanmışdır.